# Mündəricat

# İLAHİ NƏSİHƏTLƏR

## İşarə

AYƏTULLAH MƏHƏMMƏDTƏQİ MİSBAH YƏZDİ

Tərcümə edən: Əli Nur

səh:١

## Naşirin müqəddiməsi

Bəşəriyyətin ən ali məqsədi Allah-təalaya yaxın məqama çatmaqdır. Məbudla minacat ləzzətinin dadılması, insanın öz Rəbbinin pıçıltısını dinləməsi bu yaxınlaşmanın təsirlərindəndir. Bu mərhələ insan kamilliyinin son mərtəbəsidir. İnsan yalnız özünü tərbiyələndirmək, nəfslə cihad aparmaq, məbud yolunda addım atıb onun razılığını qazanmaqla bu mərtəbəyə çata bilər. Əlbəttə ki, insan hər nəyi Allahın diqqət və .tövfiqi sayəsində əldə edir

Həzrət Haqqa tabeçilik yolunda, məbuda vurğunluqda peyğəmbərlər bütün bəndələrdən öndə gəlir. Onlar özlərindən və Allahdan başqa hər nədən qırılıb məbuda bağlananlardır. Məbudun hüzur rayihəsi (qoxusu) onları sərxoş etmişdir. Onlar özlərindən ixtiyarsız məşuqun cilvələrinin tamaşasına dayanmışlar. Həmin ilahi peyğəmbərlərdən biri də ülul-əzm, uca mərtəbəli peyğəmbər həzrət Musadır. O öz ibrətamiz həyatını cihad, Firon və Allah düşmənləri ilə mübarizə, tövhidə dəvət, haqq hakimiyyət və ilahi qanunların gerçəkləşməsi yolunda sərf etdi. Həzrət Musa bu yolda o qədər irəli gedə bildi ki, Allah onu xəlvət xəlvətgahına çəkdi və ona xitabən söhbətə .başladı

Qüdsi hədislər də məhz belə məqamların məhsuludur. Onlardan bir nümunəsinin şərhi .qarşınızdadır

Ümid edirik ki, bu əsər Allah-təalanın razılığına, həzrət Mehdinin (əc.) diqqətinə səbəb .olacaq və dəyərli oxucular tərəfindən qəbul ediləcək

İmam Xomeyni adına elmi-tədqiqat müəssisəsinin yayım mərkəzi

səh:۲

Həqiqət varlıq və bəşəriyyətin ən əsil, ən əbədi və ən gözəl sirr və ehtiyaclarındandır. Həqiqət yolunda çox möminlər və sadiq alimlər candan keçdi. Həqiqət yolunda cahillər və batilpərəstlər hansı hiylələrə əl atıb qurğular qurmadılar?! Həqiqətin zülmə məruz qalması nə qədər acıdırsa, haqla batil arasında mübarizədə haqqın daimi qələbəsi bir o qədər şirindir. Batil puç olası, yerə girəsidir. Həqiqətin bu sayaq yüksəlişi onun xarakterik səciyyəsi olmaqla yanaşı, həqiqətpərəstlərin səmimi və ardıcıl təlaşlarının nəticəsidir. Onlar elm və əməl səhnəsində qol çırmamış, dünya bağlarını qırmışlar. Şübhəsiz ki, həqiqətin yüksəlişində dinlərin, ilahi peyğəmbərlərin, xüsusi ilə İslam peyğəmbəri (s) və onun həqiqi canişinlərinin rolu daha böyükdür. Məşhur şiə alimləri öz misilsiz və təhlükəli missiyalarını ağıl və dini mənbələrdən bəhrələnməklə, Quran maarifi dəryasında qəvvaslıqla zalımların hücumları qarşısında fədakarlıqla dayanmaqda görmüşlər. Onlar bu yolda canlarını fəda etmişlər. Hazırkı mənəviyyat böhranı əsrində həqiqət və bəşəriyyətin düşmənləri hər vasitə ilə dünyaya hakim olmağa çalışırlar. Onlar bu məqsədlə istehsalı gücləndirir, informasiya şəbəkəsini genişləndirir, müxtəlif sahələrdə texnoloji nailiyyətlərdən faydalanırlar. Bu meydanda həqiqətpərəstlərin, dini və dünyəvi elmlərlə məşğul olanların, xüsusi ilə din alimlərinin .məsuliyyəti olduqca böyük və ağırdır

Şiə dünyasında fəlsəfə, kəlam, təfsir, hədis, fiqh, üsul kimi sahələrdə araşdırma aparanların çox aydın proqramları var. Bu proqramlar sayəsində dinlə bağlı bütün qaranlıq nöqtələr işıqlanır. Tədqiqatçılarımızın təbiət elmləri, təcrübə sahəsi və istehsalda ciddi fəaliyyətləri var. Onların atdıqları addımlar ümidvericidir. Onlar hər an öz layiq olduqları məqama yaxınlaşmaqdadırlar. Dünyanın elm meydanında şiələrin öz

yerini tutacaqları gün yaxındadır. Amma ictimai elmlər sahəsində fəaliyyətlər qənaətbəxş deyil. Bir çox hallarda biganələrin əsərlərinin tərcümələri ilə, həmin əsərlərdən iqtibaslarla kifayətlənirlər. İslam mənbələrindən qaynaqlanan yaradıcılıq əsərləri ilə az rastlaşırıq. Bu istiqamətdə lazımi səviyyəyə yüksəlmək üçün qarşıda uzun yol var. Bəli, dini bilgilərin təfsir və izahatı, İslam maarifinin proqramlaşdırılması, ictimai elmlər istiqamətində səylərin artırılması elmi müəssisələrin və dini hövzələrin .ən mühüm məsuliyyətlərindəndir

İmam Xomeyni adına elmi-tədqiqat müəssisəsi İslam inqilabının böyük rəhbərinin dəstək və himayələri sayəsində təsis olunduğu gündən Ayətullah Məhəmmədtəqi Misbah Yəzdinin baxışlarına uyğun olaraq ciddi fəaliyyətdədir. Müəssisə elmi araşdırmalar aparır, cəmiyyətin ideoloji-dini ehtiyaclarını ödəmək istiqamətində proqram həyata keçirir. Araşdırma müəssisəsi uyğun məqsədlə həm də tədqiqatçıların əsərlərini çap edir. Həmd olsun Allaha, bu vaxtadək İslam cəmiyyətinə güc çatan .sayda əsərlər təqdim olunmuşdur

Qarşınızdakı kitab cənab Ayətullah Məhəmmədtəqi Misbah Yəzdinin hicri-qəməri ۱۴۲۶-cı ildə (hazırda hicri-qəməri ۱۴۲۸-ci il) müqəddəs Qum şəhərində böyük rəhbərlik məqamının dəftərxanasındakı çıxışlarının bir hissəsidir. Kitab dəyərli tədqiqatçı cənab höccətül-İslam Ağa Kərim Sübhani tərəfindən tərtib olunmuşdur. Bəzi qüdsi hədislər və Allah-təalanın həzrət Musaya nəsihətləri kitabın əsas mövzusunu təşkil edir. .Araşdırma mərkəzi müəllif və tədqiqatçıya bərəkətli ömür və ilahi tövfiq arzulayır

İmam Xomeyni adına elmi-tədqiqat müəssisənin araşdırma bölməsi

səh:۴

## Birinci məclis

### Allaha itaət cilvəsi və uzun–uzadı arzuların sonu

Əhli-beyt (ə) vasitəsi ilə bizə çatdırılmış rəvayətlərin bir hissəsini qüdsi hədislər təşkil edir. Bu hədisləri Allah-təala bəzi peyğəmbərlərin qəlbinə nazil etmişdir. (Peyğəmbərlər qüdsi hədisləri öz sözləri ilə nəql etmişlər. Bu səbəbdən də qüdsi hədislərdə Quranda olan cazibə yoxdur. Quranla qüdsi hədislər arasında yeddi fərq qeyd olunur: Quran möcüzədir, qüdsi hədislər möcüzə deyil; namazda yalnız Quran oxumaq olar; Quranı inkar edən kafirdir, qüdsi hədisi inkar edən kafir sayılmır; Quran Cəbrail vasitəsi ilə nazil olmuşdur; Quran lövhi-məhfuzdakı xüsusi ifadələrdən ibarətdir; qüdsi hədislərdən fərqli olaraq Quran ayələrinə dəstəmazsız toxunmaq olmaz; qüdsi hədislərin peyğəmbərlə xüsusi əlaqələndirmə üsulu yoxdur.) Bu hədislərdən bir hissəsi həzrət Musa ilə bağlıdır. Həzrət Musa Tur dağında olduğu vaxt Allahın ona xitabən buyuruqları var. Qüdsi hədislər arasında Allahla Musa arasındakı danışıqlar da öz əksini tapmışdır. Bu danışıqların bir hissəsi kitabımızın əsas .mövzusunu təşkil edir

### Ərəbcə

Allah-təala həzrət Musa ilə xəlvəti söhbətə başladı. Ona xitabən buyurdu: “Dünyada uzun-uzadı arzulara yol versən, qəlbin bərkiyər. Qəlbi daşlaşan insan məndən uzaq olar. Ey Musa! Bir növ mənim sevincim ol. Həqiqətən mənim razılığım mənə itaətdə və ”.mənə qarşı günahdan çəkinməkdədir

## Qəlbin daşlığında və qaralığında uzun–uzadı arzuların rolu

Bütün peyğəmbərlər Allahın xüsusi diqqətindən bəhrələnmiş, ən ali ilahi kamilliyə çatdıqlarından Allah bəndələrinin üstünü sayılmışlar. Amma hər bir peyğəmbərin o biriləri ilə müqayisədə müəyyən imtiyazları var. Onlar bu imtiyazları ilə tanınırlar. Məsələn, həzrət Musa “Kəlimullah” məqamına çatmışdır. O Tur dağında Allahın danışığını eşidirdi. Bu səbəbdən də onu “Kəlimullah”, yəni Allahın həmsöhbəti adlandırmışlar. Quranda oxuyuruq: “Allah Musa ilə aşkara danışdı.”(١)

Bu uca mərtəbəli peyğəmbər elə bir məqama yüksəlmişdi ki, Tur dağında öz məbudu ilə xəlvəti söhbətləşirdi. Xüsusi və ilahi söhbətlərdən birində Allah Musadan uzun-uzadı arzulara yer verməməsini istəyir. Musanın nəzərinə çatdırılır ki, uzun-uzadı arzular qəlbi daşlaşdırır, nəticədə insan ilahi mərhəmətdən məhrum olur.

Bu qəbil rəvayətlərin aydınlaşması üçün “qəlb və qəlbin daşlaşması nədir” sualına cavab verməliyik. Bu təbirlər anlaşıldıqdan sonra uzun-uzadı arzuların qəlbə təsirindən danışmaq olar.

١.Qəlb və dini təlimlərdə onun rolu

«Qəlb» sözü ayə və rəvayətlərdə tez-tez işlədilən sözlərdəndir. Bu söz gündəlik dilə də həmin mənbələrdən keçmişdir. Əlbəttə ki, hazırkı rəvayətlərdə “qəlb” dedikdə insanın köksündəki sənubər şəkilli maddi üz nəzərdə tutulmur. Dini təlimlərdə düşüncə və hisslərin mərkəzi kimi fəaliyyət göstərən həqiqət qəlb adlanır. Quran qəlbin iki xüsusiyyətini qeyd edir. Birinci xüsusiyyət onun qazanılma və verilmə (hüsuli və hüzuri) elmlərdən xəbərdarlığıdır. İkinci xüsusiyyət səh:۶

---

١-[١] “Nisa”, ١۶۴

meyllər və hisslərdir. Quran birinci xüsusiyyətlə bağlı buyurur: “Yer üzündə gəzmədilərmi ki, həqiqəti dərk edəcək qəlbləri olsun?!”(۱) İkinci xüsusiyyətlə bağlı buyurulur: “Möminlər Allah yada salındıqda qəlbləri qorxan kəslərdir.”(۲)

Quranda rastlaşdığımız “fuad” sözü də qəlb mənasında işlədilir. Buna görə də qazanılma və verilmə elmlər, meyllər və hisslər ona aid edilir. Allah-təala qəlbin müxtəlif biliklər üçün mənşə olduğunu qeyd edir: “Qəlb gördüyünü inkar etmədi.”(۳)

Şübhəsiz, ayədə hisslərlə görmək mənası nəzərdə tutulur. Qəlb mənəvi bir məfhum olduğundan onun görməsi də mənəvidir.

۲.Quranda qəlbin çaşqınlığı və daşlaşması mövzuları

Quran baxımından qəlb insan ruhundan ibarətdir. O da ruh kimi qavrayışlara, hisslərə, meyllərə malikdir. O fitrətlə eyni yol tutduqda Allaha iman mərkəzi olur, həqiqətə yönəlir, qaranlıq və pasdan təmizlənir. Quranda buyurulur: “Kim Allaha iman gətirsə, Allah onun qəlbini hidayət edər.”(۴) Amma Allaha imandan xali qəlb istər qavrayış, istər meyl baxımından bəlaya düçar olur. Quran bir çox ayələrdə yuxarıda qeyd olunan istiqamətlərdə qəlbin çaşqınlığını yada salır. Qavrayışlarla bağlı qəlbin azğınlığı haqqında buyurulur: “Öz nəfs istəyini məbud seçən, Allahın elmi üstündən azdırdığı, qulağına və qəlbinə möhür vurduğu, gözünə pərdə çəkdiyi şəxsi gördünmü? Kimdir Allahdan sonra yol göstərən? Öyüd götürmürsünüz?”(۵) Başqa bir ayədə oxuyuruq: “Allah onların qəlblərinə və qulaqlarına möhür vurub, gözlərinə pərdə çəkib. Onlar üçün böyük əzab var.”(۶)



---

۱- [۲] “Həcc”, ۴۶

۲- [۳] “Ənfal”, ۲

۳- [۴] “Nəcm”, ۱۱

۴- [۵] “Təğabun”, ۱۱

۵- [۶] “Casiyə”, ۲۳

۶- [۷] “Bəqərə”, ۷

Ayələrdən birində inadkarlıq və itaətsizlik nəticəsində hidayətdən məhrum olmuş xəstə qəlb həqiqət qapıları üzünə bağlanmış, bəsirətdən məhrum, cəhalətə üz tutmuş kora bənzədilir: “Onların gözü yox, sinələrindəki qəlbləri kordur.”(١) Başqa bir ayədə oxuyuruq: “Elə ki, əyri yola düşdülər, Allah da onların qəlblərini döndərdi.”(٢)

Ayələrdə müxtəlif meyllərlə bağlı qəlbin azğınlıqları haqqında deyilir: “Allah birliyi ilə yada salındıqda axirətə inanmayanların qəlbləri pərişan olur, Allahdan qeyrisi yada salındıqda dərhal sevinirlər.”(٣) Bəni-İsrail məzəmmət olunarkən deyilir: “Bundan sonra qəlbləriniz daş kimi, ya daha bərk daşlaşdı. Həqiqətən, bəzi daşlardan çeşmə çıxar, onlardan bəziləri parçalanar və su axar, bəziləri isə Allah qorxusundan yuvarlanar.”(۴)

Bu ayədə qəlbin bərkliyi onun azğınlıq nəticəsi kimi zikr olunur. “Qəsavət” sözü bərklik, nüfuzedilməzlik mənasını bildirir. Bəzən deyirlər ki, qəlb mərhəmətli, yumşaq və kövrəkdir. “Qəsavət” sözü isə sadalanan mənalara zidd məna bildirir. Mərhəmətdən, Allah qorxusundan xali qəlb qəsavətli sayılır. Belə bir qəlb daş kimi nüfuzedilməzdir. Qəsavət qəlbi daşdan da bərk edir. Qəlbi qəsavətli insanı başqalarının dərdi narahat etmir, belə biri kimsənin halına yanmır. Qəsavət səbəbindən moizə-nəsihət qəlbə təsir göstərə bilmir, insanın gözünün yaşı quruyur.

٣. Moizə-nəsihətin həzrət Yəhyaya güclü təsiri

İnsan təcrübədə müxtəlif hallar yaşadığına şahid olur. Bəzən moizənin təsiri altına düşür, bəzən haqqında eşitdiyi faciə onu həyəcanlandırır və gözündən yaş gəlir. Bəzən isə ən təsirli moizə, ən dəhşətli müsibət onun halını dəyişmir.



---

١- [٨] “Həcc”, ۴۶

٢- [٩] “Səff”, ۵

٣- [١٠] “Zumər”, ۴۵

۴- [١١] “Bəqərə”, ٧۴

Pak və nurani qəlbli insanlar moizələrə xeyli tez reaksiya göstərir. Pərişanlıq yumşaq qəlbin səciyyələrindəndir. Ən üstün ruhani hal isə peyğəmbərlər və övliyalarda .müşahidə olunur

Həzrət Yəhyaya moizə çox tez təsir göstərər, onun qəlbində təlatüm yaradardı. Həzrət Zəkəriyya Bəni-İsrailə nəsihət vermək istədiyi vaxt sağına-soluna baxardı ki, Yəhya oradadır, yoxsa yox. Yəhyanın hüzurunda behişt və cəhənnəmin adını çəkməzdi. Bir dəfə Yəhya məclisdə olmayan vaxt Zəkəriyya moizə-nəsihətə başladı. Əbasını başına çəkmiş Yəhya məclisə daxil oldu və bir kənarda əyləşdi. Onu görməyən Zəkəriyya söhbətə başladı: "Həbibim Cəbrail mənə xəbər verdi ki, Allah-təala buyurmuşdur: "Cəhənnəmdə Səkəran adlı bir dağ var. Dağın ətəyindəki vadiyə Ğəzəban deyirlər. Çünki həmin yer Allahın qəzəbindən dağılmışdır. Həmin vadidə bir quyu var. Onun dərinliyi yüz illik yoldur. Bu quyuda oddan tabutlar mövcuddur. ".Tabutlarda oddan libaslar, zəncirlər və buxovlar var

Zəkəriyyanın söhbətini dinləyən Yəhya fəryad qoparıb dedi: "Səkərandan necə də xəbərsizik!" Məclisdən qalxıb biyabana üz tutdu. Zəkəriyya məclisdən çıxıb Yəhyanın anasının yanına getdi və buyurdu: "Yəhyanı tap, qorxuram onu sağ görməyəsən." Yəhyanın anası onun ardınca getdi. Bəni-İsraildən bir qrupla rastlaşdı. Yəhyanın anasından haraya getdiyini soruşdular. Dedi: "Oğlum Yəhyanın ardınca gedirəm. Cəhənnəm odu haqqında eşidib səhraya üz tutub." Yəhyanın anası oğlunu soraqlaşarkən bir çobanla rastlaşdı. Ondan Yəhyanı görüb-görmədiyini soruşdu. Çoban dedi: "Bəli, Yəhyadan bir az əvvəl ayrılmışam. Göz yaşları ayaqlarını islatmışdı. Üzünü göyə tutub deyirdi: "Səni izzət və cəlalına and verirəm, ey mənim mövlam! Öz axirət mənzilimi görməyincə dilimə su vurmayacağam." Anası Yəhyanı tapıb onu (ağuşuna aldı və Allaha and verdi ki, evə qayıtsın. Yəhya anası ilə evə qayıtdı.(١

səh:٩

Məhəmməd Baqir Məclisi, "Həyatul-qülub", c. ٢, s. ١٠۴٩ [١٢]-١

Qəlbi qəsavətdən xilas etməyin zərurəti.۴

Bəzi psixoloqlar qəsavəti, qəlbidaşlığı müsbət səciyyə sayırlar. Onların nəzərincə, qəlbiyumşaqlıq, tez təsirlənmə qadınlara və uşaqlara xas olan mənfi xüsusiyyətdir. Bu səbəbdən də onlar insanların hadisələr müqabilində tez həyacanlanıb göz yaşı axıtmasını bəyənmirlər. Amma Qurani-kərim ayələrinə əsasən qəlbidaşlıq mənfi əxlaqi səciyyədir və məzəmmət olunur. Bizlər Quran göstərişlərini yerinə yetirmək əzmində olduğumuzdan ilk növbədə qəsavət kimi əxlaqi xəstəlikdən qurtulmalıyıq. Hər yolla çalışmalıyıq ki, bu xəstəlik qəlbimizə yol tapmasın. Amma bu xəstəliyə düçar olduqdan .sonra onu mənfi dəyərləndirərək aradan qaldırmağa çalışmağımız zəruridir

Heç şübhəsiz, xaşe, yəni yumşaq qəlb moizə-nəsihətləri daha tez qəbul edir. Qəsavət xəstəliyinə düçar olmuş qəlb isə heç bir moizədən təsirlənmir. Deməк, moizənin təsir göstərməsi üçün qəlb qəsavətdən xilas olunmalıdır. Qəsavət xəstəliyinə tutulmuş qəlb ilahi ayələrdən təsirlənmir, heç bir reaksiya göstərmir. "Onu tutun və buxovlayın, oda atın" kimi əzab ayələri(۱) mömінin qəlbini yerindən oynadır, onun varlığını titrədir. Qəsavətli qəlb isə bu qəbil bəyanatlardan təsirlənmir. Allah-təala Musa ilə söhbətində qəlbi bərkidən uzun-uzadı arzulardan çəkinməyə çağırır. Həzrət Musadan və bütün başqa bəndələrdən istənilir ki, uzun-uzadı arzulardan qorunsunlar. Çünki uzun-uzadı .arzular qəlbi bərkidir və nəticədə moizə-nəsihət insana təsir göstərmir

Faydalı arzuların faydasız arzulardan seçilməsi.۵

Diqqət yetirmək lazımdır ki, arzu öz-özlüyündə məzəmmət olunmur. Bir çox arzular faydalı, dəyərlidir. Böyük elmi dərəcəyə çatmaq, ilahi övliyalar cərgəsinə qatılmaq, hətta Allah bəndələrinə xidmət üçün dünyəvi məqam istəmək dəyərli arzulardandır. Uzun-uzadı arzular dedikdə bütün ömrü puça çıxaran və nəticədə axirət üçün faydası olmayan arzular



---

۱- [۱۳] "Haqqə", ۳۰-۳۲

nəzərdə tutulur. Ömrü dünya istəklərinin gerçəkləşməsinə sərf etmək istəyi bu qəbil arzulardandır. Belə arzular insanın dünya məhəbbətini gücləndirir, hətta .bəyənilməyən yollara aparır

Başlanğıc həyat mərhələsində əliboş bir insan bərbəzəkli saray tamahına düşüb bu arzusuna çatmaq üçün çalışırsa, bütün ömrünü bu işə sərf etməli olur. Əlbəttə ki, belə bir arzunu gerçəkləşdirmək üçün Allahdan uzaqlıq və başqalarının haqqını tapdamaq bahasına başa gələn sərmayəyə ehtiyac var. İnsan bu sərmayəni ələ keçirmək üçün .halal-harama baxmadan səy göstərir

Amma bir şəxs daha yaxşı ibadət etmək və Allaha yaxınlaşmaq üçün ondan nemət istəyirsə, bu ilahi istəkdir. Xalqa xidmət üçün imkan arzulayanlar əslində axirət arzusundadır. Bu zümrədən olanlar uyğun istəklərlə yanaşı bu istəklərin səmimliyini göstərən səciyyələrlə tanınırlar. Məlum olur ki, onlar ətrafdakıları aldatmaq fikrində deyillər və bəyan etdikləri arzuları sadəcə bir pərdə deyil. Şübhəsiz, belələri axirət və Allahın razılığı sorağındadırlar. Dünyapərəstlik və Allahdan xəbərsizlikdən qaynaqlanan uzun-uzadı arzular insanın bütün ömrünü puça çıxaran arzulardandır. Bu arzular insanın düşüncəsini bütünlüklə özünə məşğul edir və onun diqqətini yalnız dünyaya yönəldir. Bəzi mənəvi yönümlü arzular da uzun-uzadı arzular qismindən ola bilər. İnsan var-dövlət eşqi ilə bütün ömrünü bada verdiyi kimi, dini mərcəiyyət (alimlik) dərəcəsi almaq üçün də hər şeyi yaddan çıxara bilər. Nə pul, nə məqam, nə dini ad insan üçün son məqsəd olmamalıdır. Belə bir münasibət məzəmmət olunmuşdur və insanı doğru yoldan uzaqlaşdırır. Nəql edirlər ki, Əmirəl-möminin (ə) bir şəxsin adını çəkib buyurdu: "O rəyasət və məqam istəyindədir." Sonra həzrət əlavə etdi: "Çobansız sürüyə hücum çəkən iki canavarın zərəri rəyasətpərəst insanın (müsəlmanların dininə zərərindən daha azdır."(١



---

Məhəmməd Baqir Məclisi, "Biharul-ənvar", c. ٧٣, bab ١٢٤, s. ١٤٥ [١٤] -١

Allah-təala öz dostlarının vəsfində buyurur: “Möminlər o kəslərdir ki, Allah yada salındıqda qəlblərinə qorxu düşər, onlara ayələr oxunduqda imanları artar və öz Rəblərinə təvəkkül edərlər.”(١) Digər bir ayədə Allah zikri müqabilində mömin qəlbin uçulmasının zəruriliyi bildirilir: “İman gətirənlər üçün bir vaxt çatmadımı ki, qəlbləri (Allah zikri və nazil olmuş haqla yumşalsın?!”(٢

Təbii ki, dünya məhəbbətinə qərq olmuş və gələcək üçün planlar cızan qəlb uzun-uzadı arzulara məşğul olduğundan onda Allah zikrinə yer tapılmayacaq. Allah məhəbbətindən xali qəlbin zikr zamanı qorxu və uçulmasından danışmağa dəyməz. Çünki bir qəlbdə iki eşq yaşatmaq olmaz. Dünya bər-bəzəyinə məftun insan qəlbində ilahi eşq bəsləyə bilməz. Allah-təala buyurur: “Allah heç kimin dərinliyində iki qəlb (qərar verməyib.”(٣

Bu qəbil hədislərdən başqa bir nöqtə də aydınlaşır: möminin ən böyük amalı və arzusu Allaha yaxın məqama çatmaqdır. Əksinə, ən böyük zərər isə Allaha yaxınlıqdan məhrum olmaq sayılır. Allah qüdsi hədisdə buyurur: “Qəlbi bərkimiş insan məndən ”.uzaqdır

* * *

**İlahi göstərişlərə itaətin hikməti**

Bir növ mənim sevincim ol” buyuruğunda nəzərdə tutulur ki, daim Allahı razı salacaq“ şəkildə rəftar olunsun. Musanın nəzərinə çatdırılır ki, onun yaxşı rəftarı Allahı o qədər razı salır ki, Musa özü bir növ Allahın sevincinə çevrilir. Buyurulur: “Ey Musa! ... ”.Həqiqətən, mənim razılığım mənə itaətdə və mənə qarşı günahdan çəkinməkdədir



---

Ənfal”, ٢“ [١۵]-١

Hədid”, ١۶“ [١۶]-٢

Əhzab”, ۴“ [١٧]-٣

İlahi şəriətlərdə bəyan olunmuş və peyğəmbərlər tərəfindən insanlara çatdırılan bütün göstərişlərdə Allaha bəndəlik və günahdan çəkinmək haqqında danışılır. Allah-təala buyurur: “Bir vaxt İbrahim qövmünə dedi: “Bir Allaha pərəstiş edin, Ondan qorxun. Əgər bilsəniz, bu sizin üçün daha yaxşıdır.”(۱) Başqa bir ayədə oxuyuruq: (“Allahdan qorxun və mənə itaət edin.”(۲

Düşünməyə dəyər ki, nə üçün Allah-təala bəndələrini özünə itaətə və günahdan çəkinməyə çağırır? Bir bu qədər əmr və qadağanın hikməti nədir? Nə üçün Allah göstərişlərinə itaət onu razı salır, Ona qarşı günah Onu qəzəbləndirir? Bu nöqtələri anlamaq üçün Allah və onun sifətlərini tanımağa ehtiyac duyulur. Yalnız uyğun tanışlıqdan sonra insan öz yaranış məqsədi və dinin göndərilmə illətini anlayır. Yuxarıdakı suala qısa şəkildə belə cavab vermək olar ki, Allahın əmr və qadağaları insana təkamül yolunu göstərir. İnsan Allahın vacib əmrlərinə əməl etmək və qadağalarından çəkinməklə ilahiləşir. Əmr və qadağalar yalnız insanın özünə faydalıdır. Allah bütün bunlardan ehtiyacsızdır və bizim rəftarlarımızın ona heç bir təsiri yoxdur. Allah öz sonsuz rəhmət və feyzi ilə təkamül yolu üçün yetərli şərait yaratmışdır. İnsanın daxilində də Allah tərəfindən verilmiş təkamül istedadı vardır. Hətta azğın insan tüğyan bayrağı qaldıranda Allah onun üçün tövbə yolunu bağlamır. Bəli, insanın ilahi mərhəmətdən daha çox faydalanması və əzabdan qurtuluşu üçün zəmin yaradılmışdır. Məsələn, peyğəmbərlər üz tutduqları qövmdən ümidlərini üzüb .Allahdan əzab istədikdə, Allah bu əzabı təxirə salaraq tövbə üçün fürsət vermişdir



---

Ənkəbut”, ۱۶“ [۱۸]-۱

Şuəra”, ۱۲۶“ [۱۹]-۲

## Həzrət Nuhun əzab istəyinə Allahın cavabı

İmam Sadiqdən (ə) nəql olunmuşdur ki, həzrət Nuh ۳۰۰ il qövmünü Allaha doğru dəvət edib, yalnız inadkarlıqla rastlaşdıqdan sonra bu insanları lənətləmək qərarına gəldi. Mələklər həzrət Nuhdan bu işdən çəkinməsini istədilər. Bu istəkdən sonra Nuh öz qövmünə ۳۰۰ il möhlət verdi. Amma onlar tövbə və mütilik yolunu tutmadılar. Nuhun ömründən ۶۰۰ il ötsə də, yenə qövmü ona iman gətirmədi. Həzrət Nuh ikinci dəfə bəla istəmək qərarına gəldi. Növbəti dəfə mələklər Nuhun görüşünə gəlib, onu bu fikrindən daşındırdılar. Həzrət Nuh yenidən qövmünə ۳۰۰ il möhlət verdi. Beləcə, peyğəmbərin ömründən ۹۰۰ il ötdü, amma iman gətirənlər çox az oldu. Nuh yenidən qövmünü lənətləmək qərarına gəldi. Bu dəfə Allah-təaladan ayə nazil oldu: “Nuha vəhy oldu ki, əvvəlkilərdən savayı kimsə iman gətirməyəcək. Bunun üçün də onların əməllərinə görə qəmlənmə.”(۱) Bunun ardınca həzrət Nuh öz qövmünə nifrin oxudu: “Pərvərdigara! Bu kafirlərdən birini də yer üzündə saxlama. Əgər saxlasan onlar Sənin bəndələrini azdırar, yalnız günahkar və kafir doğub-törədərlər.”(۲)

Bəli, həzrət Nuh öz qövmünə nifrin etdi. Allah əmr etdi ki, Nuh bir xurma ağacı əksin. Xurma əkən Nuhun yanından ötənlər ۹۰۰ yaşında bu işlə məşğul olduğuna görə onu məsxərəyə qoyurdular. Ağacın əlli yaşı tamam olanda Allah əmr etdi ki, Nuh o ağacı kəssin. Bunun ardınca Allahın əzabı nazil oldu.(۳)

Allah öz bəndələrini sonsuz məhəbbətlə sevir. Bunu dərk etmək Bizim üçün çətindir. İnsanlar arasında ən ali məhəbbət



---

۱- [۲۰] “Hud”, ۳۶

۲- [۲۱] “Nuh”, ۲۷

۳- [۲۲] Əli ibn İbrahim Qummi, “Təfsirul-Qummi”

ananın övlada məhəbbətidir. Amma ananın qəlbində qərar verilmiş məhəbbət ilahi məhəbbət okeanının hətta bir damlası deyil. Allah həmin sonsuz məhəbbət əsasında bəndələrinin səadətə, Allaha yaxın məqama çatmasını istəyir. Bu məqsədlə vəzifələr müəyyənləşdirilmişdir. Bəzi işlər əmr olunmuş, bəzi işlərə qadağa qoyulmuşdur. İnsan bu göstərişlərə əməl etməklə Allahın razılığını qazanır, xoşbəxtliyə çatır. Allah hətta .günaha batan insana tövbə və günahlarını yumaq üçün möhlət verir

## Allahın razılığı və qəzəbi

Qeyd etdik ki, Allah-təala buyurur: “Mənim razılığım mənə itaətdə və günahdan çəkinməyinizdədir.” Şadlıq da qəzəb kimi hadisələrə insanın daxili reaksiyasıdır. Məsələn, insan öz istəyinə çatdıqda sevinir, biri ona müxalif olduqda qəzəblənir. Belə bir sual yaranır ki, Allah-təala dini mənbələrdə nə üçün şadlıq və qəzəb sifətləri ilə vəsf ?olunur

Cavab budur ki, Allah haqqında danışarkən uyğun təbirlərin işlədilməsində məqsəd mövzuları bizim qavrayacağımız şəkildə açıqlamaq istəyidir. Çünki insan düşüncəsi ilahi sifətləri birbaşa dərk etməkdə çox acizdir. İnsana aid olan sifətlərin Allaha aid edilməsi yalnız izahat məqsədi daşıyır və “istiarə” adlanır. Əgər insanın sifəti ilə Allahın sifətində zərrəcə oxşarlıq olursa, Allah haqqında danışarkən də uyğun sifətlərdən istifadə olunur. Əslində insanın sifətləri üçün məhdudiyyət olduğu halda, ilahi sifətlər üçün heç bir məhdudiyyət yoxdur. İlahi sifətlər dəyişməz və zavala uğramazdır. Şadlıq deyilən hal Allahda yaranmır. Qəzəb sifəti də belədir. Allahın razılıq və qəzəbi həmişəlikdir. Allahın razılığına səbəb olan işlər onu şad edir, onun razılığına zidd olan işlər qəzəbinə səbəb olur. Allahın qəzəbi də daimidir. Nümunə göstərək: imam Həsən (ə) “Ərəfə” duasında ilahi sifətlərin zati olması ilə bağlı deyir: “Pərvərdigara! Sənin razılığın nöqsan və eybdən pakdır. Necə olur ki, mənim tərəfimdən əskiklik ona yol ”?tapır

Əslində ilahi zat eynən kamal olduğundan hər bir mövcudun kamilliyi ilahi zata münasibdir və Allahın razılığından qaynaqlanır. İlahi kamalın ziddi olan və Allahın .qəzəbi ilə dəyişən hər bir şey insanın süqut səbəbidir

Azğın) qəlbini Allah qorxusu (xəşyət-zərər yox, kiçiklik qorxusu) ilə öldür. Libasların)“ köhnə, qəlbin təzə və təravətli olsun. Yer əhlinə tanınma, mələklər və göy əhlinə tanın. Evin döşənəcəyi ol (şöhrətdən çəkin). Gecənin çırağı ol (gecə oyaq qal, çıraq tək işıq saç). Hüzurumda səbirlilər tək qunut tut (hövsələ ilə raz-niyaza dur). İbadət zamanı günahlarının çoxluğuna görə qarşımda günahkar, düşmənindən qaçan kəs kimi nalə çək. Həmin halda məndən yardım dilə. Çünki mən ən yaxşı yardımçı, yardım istənilən ”.ən üstün kəsəm

## Allah qorxusunun insan qəlbinə təsiri

Allah-təala həzrət Musaya tövsiyə edir ki, qəlbini Allah qorxusu ilə öldürsün. Mətndə qorxu mənası “xəşyət” sözü ilə ifadə olunmuşdur. “Xəşyət” və “xof” sözləri arasında bir o qədər də fərq yoxdur. Ayə və rəvayətləri nəzərdən keçirdikdə uyğun təbirlər arasında nəzərə çarpacaq fərq görünmür. Hətta bu sözlər bir-birinin əvəzinə də işlənir. Amma dəqiq təhlillə onları bir-birindən fərqləndirmək olur. “Xəşyət” dedikdə insanın əzəmətli bir varlıq qarşısında öz kiçikliyini hiss etməsi başa düşülür. Məsələn, insan Allahın əzəmətini dərk etdiyi vaxt onda təvazö hissi yaranır. Allah özü insanın daxilində belə bir hal üçün zəmin yaratmışdır. Əlbəttə ki, bu hiss təkcə bəşər övladına aid deyil. Başqa canlı varlıqlar da özündən böyük varlıq qarşısında kiçiklik hiss edir. Amma “xof” dedikdə zərər qorxusu nəzərdə tutulur. Allah qarşısında xof dedikdə pis əməllərdən qaynaqlanan əzaba görə qorxu nəzərdə tutulur. Allah qorxusu ilahi hüzurun dərki və məbuda diqqət üçün

şərtdir. Bu qorxu əməl və rəftara münasibətdə qəfləti aradan qaldırır. Allah qorxusu bir çox ayə və rəvayətlərdə mədh olunmuş sifətdir. Müəyyən ayələrə əsasən peyğəmbərlərin göstərişlərindən faydalanmaq və əbədi səadətə çatmaq üçün Allah qorxusu şərtdir: Sən yalnız Allah ayələrinə tabe olan və xəlvətdə mehriban Allahdan qorxan kəsi qorxuda bilərsən. Beləsini Allahın böyük əcri ilə müjdələ."(۱)

Hədisin bu hissəsində qəlbin Allah qorxusu ilə öldürülməsindən və bunun ardınca onun təravətindən danışılır. Qəlbin təravəti dedikdə onun diriliyi nəzərdə tutulur. Məsələnin batininə varmadıqda bu iki nöqtə bir-birinə zidd görünür. Ayə və rəvayətlərdə zahirən bir-birinə zidd görünən qəlbə aid sifətlər çoxdur. Yalnız düşüncə və araşdırmalar vasitəsi ilə buradakı uyğunluğu hiss etmək olar. Hazırkı hədisdə də zahirən uyuşmayan nöqtələr nəzərə çarpır. Bir tərəfdən Allah qorxusu ilə qəlbi öldürməkdən, digər tərəfdən onu diriltməkdən danışılır. Yəni bir tərəfdən qəlbin öldürülməsi, digər tərəfdən onun dirildilməsi istənilir. Əmirəl-möminin Əli (ə) imam Həsən Müctəbaya (ə) buyurur: "Qəlbini moizə-nəsihətlə dirilt, paklıqla öldür."(۲) Həzrət hazırkı buyuruğunda qəlbi moizə-nəsihət vasitəsi ilə diriltməyi tapşırır. Şübhəsiz ki, insanda Allah qorxusu yaradan moizə nəzərdə tutulur. Həzrət sözünün davamında buyurur ki, qəlbini paklıqla öldür. Başqa bir hədisdə də Allah-təalanın belə bir buyuruğu ilə rastlaşırıq: qəlbini Allah qorxusu ilə öldür." Maraqlıdır, qəlbi öldürmək, həm də diriltmək tapşırıqları bir-birinə zidd deyilmi? Allah-təala Quranın nazil olma fəlsəfəsi haqqında buyurur: "(Quran nazil oldu ki) kim (qəlbən) dirisə qorxutsun və kafirlərə münasibətdə (Allahın) buyuruğu gerçəkləşsin."(۳)

Bu ayədə ilahi öyüd-nəsihəti dinləyib, qəlbini ilahi hidayət nuru ilə işıqlandıran şəxs diri qəlbli insan kimi tanıtdırılır.



---

۱- [۲۳] "Yasin", ۱۱

۲- [۲۴] "Nəhcül-bəlağə", ۳۱-ci məktub

۳- [۲۵] "Yasin", ۷۰

Ayədən məlum olur ki, Allah insanın diri qəlbli olmasını istəyir. Başqa bir ayədə Allah-təala başqalarının düşdüyü əzabdan ibrət götürən bəndəni diri qəlbli kimi tanıtdırır: “Şübhəsiz, bu cəzalarda qəlb sahibi və dinləyib şahid olan üçün ibrət və xəbərdarlıq (var.”(١

Ayədən məlum olur ki, insanlar iki qisimdir: birinci qisimdən olanlar qəlb sahibidirlər, öyüd-nəsihətdən bəhrələnirlər, ilahi əzab onları oyadır. İkinci qisimdən olanlar isə qafillərdir və onların qəlbləri yoxdur. Şübhəsiz ki, burada sənubər şəkilli maddi ürək nəzərdə tutulmur. Rəvayətdə düşüncə və hisslərin mərkəzi olan qəlbə də işarə .olunmamışdır. Çünki müsbət və mənfi hisslərdən məhrum insan olmur

## Zidd sifətlərin qəlbə aid edilməsinin izahı

Dini mətnlərdə zidd sifətlərin qəlbə aid edilməsi, bəzilərinin qəlb sahibi kimi, bəzilərinin qəlbdən məhrum kimi tanıtdırılması sual doğurur. Sualı belə cavablandırmaq olar: “Qəlb”, “nəfs” kimi sözlərin müxtəlif mənaları var. Ardıcıllıq, uyğunluq və söhbətin məzmunundan nəzərdə tutulmuş mənanı müəyyənləşdirmək olar. Ötən söhbətdə :qeyd olunduğu kimi, qəlbin üç səciyyəsi və işlənmə yeri var

Qəlb düşüncə, idrak və ağıl mərkəzidir. İnsan qəlb vasitəsi ilə düşünüb təhlil aparır..١ Allah düşüncəni qəlbə məxsus səciyyə sayır: “Məgər yer üzündə gəzmirlərmi ki, (vasitəsi ilə düşünəcəkləri qəlbləri olsun?”(٢

Verilmə (şühudi, hüzuri) biliklər qəlb vasitəsi ilə əldə olunur. Bu biliklərin qəbulu .٢ qazanılma (hüsuli) elmin qəbulundan fərqlənir. Dini mənbələrdə qəlbə verilən biliklər “röyət” adlandırılmışdır. Əmirəl-möminin (ə) qəlbin bu xüsusiyyəti haqqında buyurur: “Gözlər onu cisim kimi



---

١- [٢۶] “Qaf”, ٣٧

٢- [٢٧] “Həcc”, ۴۶

(görməzlər. Amma qəlblər həqiqi iman sayəsində onu dərk edər."(١

.Qəlbin üçüncü işi hiss və duyğular mərkəzi olmasıdır.٣

Qəlbin üç işi ilə tanış olduqdan sonra aydınlaşır ki, sağlam və diri qəlb dedikdə bəyənilmiş düşüncə və biliyə sahib olan qəlb nəzərdə tutulur. Belə bir qəlbin ruhani şahidlik istedadı da olmalıdır. Onun müsbət hiss və duyğularla yaşaması da zəruridir. Başqalarına münasibətdə düşmənçilik də hiss sayılır. Amma bu qəbil hisslər bəyənilməmişdir. Sağlam qəlb düzgün istiqamətdə istifadə edilən qəlbdir. Onun düşüncəsi, hiss və duyğuları pakdır. Əksinə, bəyənilməmiş düşüncə və hisslərə sahib olan qəlb qəlb sayılmır. Dini mənbələrdə həqiqəti görməyən göz kor kimi tanıtdırılır. Beləcə, həqiqətləri dərk etməyən qəlb də sağlam qəlb sayılmır və kor kimi tanıtdırılır: ("Həqiqətən, gözlər yox, sinələrdəki qəlblər kordur."(٢

## Qəlb üçün arzulanan həyatın səciyyələri

Sual olunur ki, qəlb üçün həyat üstündür, yoxsa ölüm? Sualın cavabında qeyd etməliyik ki, qəlbin fərqli həyatları var. Bəzən qəlbin həyatı səmərəli olur, insan bu həyat sayəsində kamala çatır. Şübhəsiz ki, belə bir həyat arzulanandır. Amma bəzən qəlbin həyatı məstlik və qəflət kimi təsirlərə malik olur. Əlbəttə ki, qəlb üçün belə bir həyat bəyənilmir. Uyğun vəziyyətdə qəlb üçün ölüm həyatdan üstün sayılır. İnsan üçün həyat o zaman faydalı olur ki, bu həyatın arzulanan nəticələri olsun. Əks təqdirdə həyat faydasızdır və ölüm ondan üstün sayılır. Bir həyatda ki, insanı dəyərli edən, onu kamala çatdıran istedadlar çiçəklənmir, belə bir həyatı həyat adlandırmaq olmaz. Allah-təala bu nöqtəni işıqlandırmaq üçün cəhənnəm səh:٢٠

---

Nəhcül-bəlağə", xütbə ١٧٩" [٢٨]-١

Həcc", ٤٦" [٢٩]-٢

(əhlinin həyatını təsvir edir: “Bir vaxt ki, orada (odda) nə ölərlər, nə də yaşayarlar.”(۱)

Cəhənnəm oduna düçar olan kəs ölmür. Axı ölü odu hiss edə bilməz. Amma Quran baxımından belə bir insan diri də deyil. Çünki qiyamətdə yalnız Allahın razılığını qazananlar, behişt nemətinə çatanlar həqiqi həyat sürür. Qiyamətdə əzab çəkən isə .gerçək həyatdan məhrumdur

Arzulanan təsirlərə, inkişaf zəminə malik olan həyat həyat sayılır. İnsanın gerçək ehtiyacları yalnız belə bir həyatda təmin olunur. Bu həyat insanı ali kamilliklərə çatdırır. Quran insanları məhz belə bir həyata dəvət edir. Quran belə bir həyatı nəzərdə tutaraq öncə qəflət içində olmuş insanlara minnət qoyub bildirir ki, peyğəmbərlər və hidayət göndərməklə insanlara həyat verilmişdir: “(Qəlbi) öldüyü vaxt diriltdiyimiz, xalq arasında getməsi üçün nur qərar verdiyimiz kəs qaranlıqda yol gedib ondan çıxmayası (şəxs kimidirmi?”(۲)

Bəli, Quran baxımından, həqiqi həyat nurludur və bu nur düzgün həyat yolunu işıqlandırır. Həmin nur sayəsində insan öz xeyir-ziyanını tanıyır, bəsirətlə öz xoşbəxtliyinə doğru addım atır. Amma şəhvətlər, maddi ləzzətlər, həqiqətdən xəbərsizlik içində ötüşən heyvani həyat əsil ölümdür. Belə bir rəzil həyatı yaşamaqla insan xoşbəxtlik və səadətdən məhrum olur, Allah elçilərinin tövsiyələrindən faydalana bilmir. Allahın böyük peyğəmbərlərinin təkidləri də belə bir qəlbi oyatmır. Allah-təala peyğəmbərinə təsəlli verərək buyurur: “Sən arxa çevirdikləri bir vaxt ölüləri eşidən edib karlara dəvət səsini çatdıra bilməzsən. Sən korlara yol göstərən deyilsən, onlara eşitdirə bilməzsən. Yalnız ayələrimizə iman gətirənlər, müsəlmanlar (istisnadır.”(۳)



---

Ə’la”, ۱۳“ [۳۰] -۱

Ən’am”, ۱۲۲“ [۳۱] -۲

Qəsəs”, ۷۶“ [۳۲] -۳

Biz mənəvi və ruhani həyat haqqında danışdıq. Amma qəlb heyvani hisslərin duyulması səbəbindən diri sayılır. Əksinə, heyvani hisslərdən məhrum qəlbi ölü adlandırırlar. Əlbəttə ki, insan təbiətinin tələb etdikləri məqbuldur. İstər dünyəvi, istər üxrəvi (axirətə aid) baxımdan təbii istək qəbul olunur. Şadlıq və ləzzət öz-özlüyündə pislənilmir. Xüsusi ilə bu istək Allah tərəfindən məqbuldursa və imam Mehdinin (əc.) razılığı ilə qarşılanırsa axirət səadətinə aparır. Amma peyğəmbər məktəbində tərbiyə alanlardan savayı hər bir insanın şadlığı dünyəvidir və dünya üçündür. Belələri dünya həyatını əsas götürdüklərindən dünya ehtiyacları ödəndikdə sevinir, bu ehtiyaclar təmin olunmadıqda qəmlənirlər. Əlbəttə ki, belə bir hal xoşagəlməzdir. Allah-təala buyurur: “Allah (məst halda) şadlananları sevmir.”(١) Ayədəki “fərih” sözü “şadlanan” kimi tərcümə olunmuşdur. Əslində “fərih” dedikdə ifrat dünyəvi ləzzətlərdən sevinən kəs nəzərdə tutulur. Şübhəsiz, bu sayağı şadlıq məqbul deyil. Bu qəbil şadlıqlar uşaq sayağı və düşüncəsiz şadlıqlardır. “Fərih” sözü əslində “sərxoş” kimi tərcümə .olunmalıdır

Peyğəmbər məktəbində tərbiyə almayanlar bəzən bu sayağı məstliyə düçar olur, şadlıqdan əl-ayaqlarını itirirlər. Onlar öz dərisinə sığmır, ilahi vəzifələri yaddan çıxarırlar. Qəflət və xəbərsizlik onların qəlbini qaraldır. Nəticədə ibadət və minacata şövqdən məhrum edilirlər. Bu qəbil insanlar adətən hər məclisi qəh-qəhə və zarafatla keçirir, hətta ayaqlarını yerə döyüb rəqs edirlər. Bəziləri bu növ sərxoşluğu qəlbin diriliyi kimi tanıtdırır. Kim bu halda deyilsə, onların nəzərincə, qəlbi ölmüşdür. Şübhəsiz, bu sayağı şadlıqlar qəbul deyil. İnsan özündə yaranan bu halla mübarizə aparmalıdır.

Belə yalançı şadlıqları öldürmək zəruridir. Cahilanə şadlıqla mübarizə halını səh:٢٢

---

Qəsəs”, ٧۶“ [٣٣] -١

qəlbin ölülüyü kimi təqdim etmək düzgün deyil. İnsan qəlbində pərişanlıq zəmini yaratmalıdır. Öz danışıq və rəftarı barədə düşünməklə səhvlərinə görə ağlamalı, Allahın diqqəti üçün zəmin yaratmalıdır. Bu səbəbdən də Allah-təala həzrət Musaya ".buyurur: "Qəlbini Allah-qorxusu ilə öldür

İnsanı Allahın əzəməti haqqında düşünməyə vadar edən qəlbdəki xof halıdır. Əksinə, şeytani məstlik və qürur insanın diqqətini Allahdan yayındırır, onun öz məbudunu dərk etmək gücünü əlindən alır. Bu xəstəliklə mübarizə üçün azğın nəfsə nəzarət etmək zəruridir. Bu nəzarət insanda təvazö halı yaratmalı, çirkin əməlləri üzə çıxarmalıdır. Nəticədə, qəlbdə Allahdan xof halı yaranır və düzgün düşüncədən, hikmətli öyüd-nəsihətlərdən bəhrələnmək üçün yol açılır. Qurani-kərimdə oxuyuruq: "Sənin qorxutmağın yalnız o kəs üçündür ki, haqq kitaba tabe ola, qəlbində Rəhman Allahdan (qorxa."(١)

Peyğəmbərlərin mühüm vəzifəsi olan xəbərdarlıq yalnız Allahdan qorxanlara təsir edir. Nə qədər ki, qəlbdə xof halı yaranmayıb, insan qürur və məstlikdən uzaqlaşmayıb, fərd öz eyblərindən xəbər tutmayıb, öyüd-nəsihətlər onun qəlbinə təsir edəsi deyil. Belə bir insan dünya əyləncələrini, vaxtını eyş-işrət məclisində keçirməyi, əyləncəli səhnələrə tamaşa etməyi qiyamət və cəhənnəm əzabını yada salan moizə-nəsihətdən üstün tutasıdır. Belə bir şəxs hətta təsadüfən moizə-nəsihət məclisinə .düşdükdə deyilənlər ona təsir göstərəsi deyil

Beləcə, qəlbin qəsavətdən (daşlıqdan) təmizlənməsi, Allahdan qorxu halının yaranması heyvani həyat cazibələrinin ölümünə, ilahi həyatın dirçəlişinə səbəb olur. İlahi və mənəvi həyat sayəsində insan Allah qarşısında öz kiçikliyini hiss etməyə başlayır, öz Rəbbi ilə ünsiyyətə qatılır. Belə ki, o Allahdan xəbərsizlik nişanəsi olan dünya görüntülərinə bağlılıqdan xilas olur. O dərk edir ki, Allaha yaxın məqama çatmaq, axirət aləmində Onun razılığını qazanmaq üçün yaradılmışdır. Belə bir insan cəvahiratı dəyərsiz şüşədən



---

Yasin", ١١" [٣۴] -١

təmizləyən şəxsə bənzəyir. Onun qarşısına cəvahir adı ilə adi şüşə qoyulduqda aldadıldığını hiss edən kimi təqdim olunanlardan imtina edib həqiqi cəvahir axtarışına .çıxır

Mənəvi və üxrəvi ləzzətlərin, Allahla ünsiyyətin həqiqi dəyərini bilən kəs anlayır ki, dünya ləzzətləri fənadır və onlara görə axirət ləzzətlərini əldən vermək ağılsızlıqdır. Allahla ünsiyyət ləzzətini dadan kəs qiymətli libas kimi dünya bəzəklərinə etina göstərmir. Onun nəzərində bu sayaq bağlılıqlar uşaqlıqdır. Uşağı sevindirən şeylərdən məhrumluq belə bir şəxsi qəmləndirmir. İnsan dünyaya etinasızlıq, dünya təzahürlərinə biganə olduqda rahatlıqla dünyadan əl çəkir və ixtiyarında olanları əlini .sıxmadan başqalarına verir

**Allah dostlarının sadə yaşayışı və şöhrətdən qaçması**

Allah-təala həzrət Musaya tövsiyə edir ki, təzə yox, köhnə libas geyinsin. Bəli, mömin bir tərəfdən zahiri dəyərlərə uymamalı, digər bir tərəfdən bilməlidir ki, sadə libas ondakı təvazö halını gücləndirəsidir. Adətən, insanlar təzə və qiymətli libas geyənlərə qibtə ilə baxır. Təzə və qiymətli libas geyinən şəxs başqalarının ona olan diqqətinin artdığını görüb daha artıq bəzənməyə çalışır. Bu halda onun qəlbindəki Allah qorxusu zəifləyir. Sadə və köhnə libasa isə heç vaxt əhəmiyyət verən olmur. İnsan bu qəbil libaslarda başqalarının diqqətini cəlb etmir, zahirinə görə sevinmir. Onun üçün ilahi və mənəvi gözəlliklər cəvahir gözəlliyindən çox dəyərlidir. Bu qəbil insanlar üçün gözəl libas kimi dünya cazibələri əhəmiyyətsizdir. Onlar çalışırlar ki, xalqın diqqətini cəlb etməmək üçün təzə libaslar geyməsinlər. Onlar əmindirlər ki, təkamül fikrində olanlar .üçün xalq diqqəti böyük bəladır

Şöhrət, ad-san, xalqın ehtiramı insanın Allaha diqqətini əskildir. Allahla ünsiyyətdə olan insan nəinki xalqın diqqətindən ləzzət almır, əksinə bu diqqət onu narahat edir. Çünki bu diqqət onun Allaha diqqəti üçün maneədir. Məsələn, ona verilən salam, ona göstərilən ehtiram bir anlıq da olsa, onu

öz məhbubuna diqqətdən ayırır. Demək, insanların diqqət və ehtiramı nəinki faydasızdır, hətta mənəvi məsələlərə diqqəti yayındırır. Allah-təala öz məhbubu Musaya köhnə libas geyinməyi tövsiyə edir. Onun nəzərinə çatdırır ki, xalq arasında tanınmaqdan çəkinsin, səma əhli ilə tanışlığa çalışsın. Onun yalnız mələklər, Allah .övliyaları ilə tanışlığı faydalıdır. Bu sayaq tanışlıqlar təkamül yolu üçün faydalıdır

Bu qəbil əxlaqi göstərişlər bizi ifrat və təfritə sövq etməməlidir. Şöhrətdən çəkinmək, barmaqla göstərilməmək müsbət əxlaqi keyfiyyətdir. Belə bir münasibətin həm ictimai, həm də əxlaqi təsirləri var. Ruhani və mənəvi yüksəliş sorağında olan insan şan-şöhrətdən çəkinsə diqqətini məbuda daha yaxşı yönəldə bilər. Amma bu əxlaqi tövsiyədən sui-istifadə etmək olmaz. Xalqın nəzəri mühüm deyildir deyə, cəmiyyətdən kənara çəkilmək düzgün deyil. İnsan guşənişin olmamalıdır. Cəmiyyətdən kənara çəkilən insan öz ictimai vəzifələrinə əməl edə bilməz. Xalqa xidmət, ehtiyaclılara yardım, haqqın təbliği, təhsil bizim mühüm vəzifələrimizdəndir. İnsan yalnız ictimai həyatda bu dəyərlərə sahib ola bilir. Əgər alim tanınmasa və özünü təqdim etməsə, insanlar elm və dini vəzifələrlə tanış olmaq üçün ona üz tutmazlar. Nəticədə alimin elmi səmərəsiz olar. Demək, bir çox vəzifələrin, o cümlədən ibadətlərin ictimai yönümü var. Cəmiyyətə qatılmadan bu vəzifələri yerinə yetirmək mümkün deyil. Cəmiyyətdən uzaqlaşmaq istəyən kəs yaxşılığa çağırış və pislikdən çəkindirmə kimi mühüm dini vəzifələrini yerinə yetirə bilmir. O başqalarına xidmətdən, təlim-tərbiyədən məhrum .olur

Məqsədimiz budur ki, şan-şöhrət insanın zati istəyinə çevrilməməlidir. İnsan həyatını ictimai mövqe və xalqın diqqətini cəlb etməyə sərf etməməlidir. Şöhrət və ictimai mövqe vəzifələrin icrası üçün vasitə olmalıdır. İnsan tutduğu məqam və qazandığı sevgidən dini və ictimai vəzifələrinin icrasında istifadə etməlidir. Bəyənilməyən budur ki, şan-şöhrət

və ictimai məqam insanın əsas həyat amalına çevrilsin. Bütün bunlar Allaha yaxınlıq üçün vasitə seçildikdə məzəmmət olunmur. Bəzən vəzifələrin icrası üçün məqam və sevgi qazanmaq zərurətə çevrilir. Əgər var-dövlətdən xalqa yardım və Allahın razılığı üçün istifadə olunarsa, bu yaxşıdır. Pis budur ki, var-dövlət toplamaq insanın əsas məqsədi olsun. Bu halda dünyapərəstlik insanın ruhiyyəsinə hopur. Bu ruhiyyə onu çirkin yollara əl atmağa da vadar edir. Yalnız var-dövlət toplamaq fikrində olan insan qanun tanımır. Bir çox din alimlərinin şöhrət və sevgidən çəkinməməsinə pis baxmamalıyıq. Onlar yazdıqları kitabların üzərinə öz adlarını qeyd edir, tez-tez cəmiyyətdə görünürlər. Əgər onların bu münasibəti dinin yayılmasına kömək edirsə .onları məzəmmət etməməliyik

**Mömin və xəlvətə maraq**

Allah-təala həzrət Musaya köhnə libas geyinməyi tövsiyə etdikdən sonra qəlbini təravətli saxlamağı tapşırır. Yəni möminin qəlbi fəal, diqqətli olmalıdır. Mömin insan xalqa can yandırmalı, ətrafdakılara mehribanlıq göstərməklə Allahla rabitəsini gücləndirməlidir. Möminin qəlbi insanlara sevgi ocağıdır. Bu məhəbbət onu insanlara xidmətə vadar edir, birlik yaradır. İnsanlara sevgi ictimai məsuliyyət hissinin şərtidir. Bu sevgi sayəsində fərd cəmiyyəti təkamül yoluna sövq edə bilir. Mömin başqalarının .problemlərinə biganə olmamalıdır

İstənilən bir halda möminin qəlbi təravətli və fəal olmalıdır. Möminin qəm-qüssəsindən danışan rəvayətlərdə nəzərdə tutulur ki, bu qəm-qüssə onu qəflətdən oyatsın öz əməllərinə görə pərişan olan kəs tövbə qılıb doğru yolu tutur. İnsanı bədbinləşdirən qəm-qüssə bəyənilməmişdir. İnsanı təhsilə, ibadətə, ailə-övlad qarşısında .məsuliyyətə biganələşdirən qəm-qüssə İslam dinində məzəmmət olunur

Əlbəttə ki, ictimailikdə də ifrata varmaq pisdir. Bütün vaxtı ətrafdakılara sərf edib özü barədə düşünməmək yanlış səh:۲۶

yoldur. Allah-təala həzrət Musaya tövsiyə edir ki, xəlvətə çəkilsin, evin yerinə sərilmiş döşənəcək kimi bir yerdə qalsın. Bəziləri tənhalıqdan qaçırlar. Çalışırlar ki, daim dostlar arasında olsunlar və bu məclisdə qəbul olunmaq üçün məclisin gedişinə uyğun pis işlərə qatılırlar. Təbii ki, bu qəbil xüsusiyyətlər bəyənilmir. İnsan tənhalığı özü və məbudu haqqında düşüncə üçün fürsət saymalıdır. İnsan tənhalığa vərdiş verməli, cəmiyyətdən ayrılmağı bacarmalıdır. Yalnız bu halda o Allahla raz-niyaza həvəslə vaxt ayıra bilər. Tənhalıqdan sıxılan insan çox çətinliklə namaza bir neçə dəqiqə vaxt ayırır. Belə biri çətin ki, Allahla raz-niyaza saatlarla vaxt ayıra. Onun Allahla minacat üçün xəlvətə çəkilməsi çətin məsələdir. Bəziləri hətta özünü unutmaq üçün, vəzifə məsuliyyəti barədə düşünməmək xatirinə mənasız işlərlə məşğul olub başını qatır. Onlar oturub uzun-uzadı seriyallara baxır, film başa çatan kimi krossvord doldurmağa başlayır, qalan vaxtını dostlarla söhbətə sərf edir. Allahın dostları isə Allahla minacat üçün xəlvətə çəkilməkdən ləzzət alırlar. Onlar bu məqsədlə saatlarla bir yerdə əyləşir və bundan yorulmurlar. Onlar Allahın təyin etdiyi vəzifələri yerinə yetirmək üçün cəmiyyətə çıxır, ünsiyyətə qatılırlar. Onlar cəmiyyət arasında da Allahı yaddan çıxarmamağa çalışırlar. Səy göstərirlər ki, onların Allahla rabitəsinə heç nə mane .olmasın

Allah-təalanın həzrət Musaya tövsiyəsinə diqqətlə yanaşmalıyıq. Məbada belə bir qənaətə gələk ki, mömin guşənişin olmalı, cəmiyyətdən uzaqlaşmalıdır. Cəmiyyətdən kənara çəkilmiş insan təhsildən və başqa ictimai faydalardan məhrum olur. Bəli, maddi meyllərin gücləndiyi dövrümüzdə bu sayağı çaşqınlıqlar az olur. Amma qədim vaxtlar insanlar bu qəbil rəvayətlərə əsaslanaraq cəmiyyətdən kənarlaşmağı vacib sayırdılar.(١) Hansı ki, “evlərinizin döşənəcəyi olun” kimi rəvayətlər başqa məqsəd daşımışdır. Bu rəvayətlər arasında dünyanın son dövründə yaşayacaq insanlara ünvanlanmış



---

Bax: “Biharul-ənvar”, c. ٥٢, s. ١٣٨ [٣٥] -١

göstərişlər də var. Həmin vaxt ətrafda günah çoxaldığından insanlara tövsiyə olunur ki, cəmiyyətdən kənara çəkilsinlər. Adi vaxtlarda isə guşənişinlik pislənilir, çünki bu xüsusiyyət insanı əmr və qadağa vəzifəsindən, xalqa xidmətdən, ehtiyaclılara .yardımdan, bir sözlə ictimai fəaliyyətdən çəkindirir

### Üçüncü məclis

#### İlahi hakimiyyət və tədbirə etiqadın görüntüsü

“Ey Musa! Mən Allaham və bəndələrdən üstünəm. Bəndələr məndən aşağıdır və hər biri qarşımda zəlildir. Nəfsini daim ittiham et (heç vaxt ona arxayın olma; qorx ki, səni aldadıb xoşbəxtliyini əlindən ala). Dininə münasibətdə övladına (da) etimad göstərmə. Saleh insanları eynən sənin kimi sevən övlad istisnadır.”

#### Tövhidə və Allahın aləmdə hakimiyyətinə etiqadın zəruriliyi

Minacatın bu hissəsində Allah-təala dörd mühüm məsələni bəyan edir:

#### Həqiqi tövhidə etiqad

Belə bir etiqada əsasən insan bütün işlərində Allahın iradə və tədbirinə istinad edir, Allahı bütün məxluqlardan üstün sayır. Aydındır ki, keçmiş qövmlərin bir çox büdrəmələrinin və fəsada uğramalarının qaynağı onların tövhidə etiqadsızlığı olmuşdur. Onlar Allaha inanmaqla yanaşı bütlərə də tapınmış, əksər işlərində onlara arxalanmışlar. Hətta bütlərə pərəstiş də olunmuşdur. Həmin qövmlər Allahı pərəstişə layiq bildikləri kimi Allahdan qeyrilərinin də müdiriyyət məqamını qəbul etmişlər. Bu cür büdrəmə bir çox etiqadi, əxlaqi və əməli fəsadların mənşəsidir.

Quran müşriklərin bütlərə etiqadı haqqında buyurur: “O kəslər ki, Allahın yerinə özlərinə dostlar seçdilər. (Bəhanə gətirdilər ki,) biz onlara yalnız bizi Allaha (yaxınlaşdırsınlar deyə pərəstiş edirik.”(١)

Göründüyü kimi, müşriklər Allahı inkar etmirdilər. Onlar bütləri Allaha yaxınlaşmaq üçün vasitə sayır, onlara ibadət edirdilər. Başqa bir ayədə Allahdan qeyrisinə pərəstiş haqqında oxuyuruq: “Allahın yerinə elə şeylərə pərəstiş edirlər ki, həmin şeylərin onlara nə ziyanı var, nə də xeyiri. Deyirlər ki, bunlar Allah yanında bizim (şəfaətçilərimizdir.”(٢)

Sual: Müşriklərin bütlərin, bizim Allah övliyalarının şəfaətinə etiqadımız arasında nə ?kimi fərq var

Cavab: Müşriklərin etiqadına əsasən şəfaətçi Allahın istəyindən asılı olmayaraq şəfaət verə bilər. Guya bütlər bilavasitə bağışlatdırmaq gücünə malikdir. Əslində isə şəfaətin qəbulu Allahın iradəsindən və şəfaətçinin ləyaqətindən asılıdır. Müşriklər inanırdılar ki, mələklər Allahın qızlarıdır və mələklərin timsalı saydıqları bütlərə pərəstiş edirdilər. Onlar bu yolla tanrılarının qızları qarşısında hörmət qazanmağa çalışır, bütlərin şəfaəti ilə cəhənnəmdən qurtulacaqlarına ümid edirdilər. Onların nəzərincə Allah şəfaəti qəbul etməyə məcburdur. Həqiqətdə belə bir şəfaət batil və şirkdir. Qanunun ziddinə şəfaət şəfaət yox, dəstəbazlıqdır. Belə bir şəfaətdə insanın ləyaqəti nəzərə alınmır. Guya bütün iş şəfaətçidən asılıdır. Müşriklər düşünürlər ki, Allah şəfaətçilərlə yaxınlığı və .onlardan asılılığı səbəbindən şəfaəti qəbul etməyə məcburdur

Amma tövhid inancına əsasən, bütün işlər Allahın istək və iradəsindən asılıdır. Həqiqi istiqlal yalnız Allaha aiddir. Allahdan savayı kimsədə təsir müstəqilliyi yoxdur. Həm od və su kimi təbii amillər, həm də peyğəmbərlər və imamlar kimi qeyri-təbii amillər Allahın iradəsinə bağlıdır. Deməl, peyğəmbərlərin və övliyaların şəfaəti Allahın izni ilə .baş tutur



---

١- [٣۶] “Zumər”, ٣

٢- [٣٧] “Yunis”, ١٨

Allahın izni olmadan şəfaətdən faydalanmaq mümkünsüzdür. Quranda oxuyuruq: (“Onun izni olmadan hüzurunda şəfaət verən kimdir?!”(١

Ölüləri diriltmək, kor gözə şəfa vermək yalnız Allahın izni və peyğəmbərə verdiyi qüdrətlə həyata keçən möcüzələrdir. Övliyalar Allahın nümayəndəsi olaraq Onun izni ilə möcüzələr göstərmişlər. Allahın hökmü olmadan kimsədə qeyri-təbii işlər görmək iqtidarı yoxdur. Bu səbəbdən də Allah-təala həzrət İsa haqqında buyurur: “Onu peyğəmbər olaraq Bəni-İsrailə doğru (göndərər və o deyər:) həqiqətən, mən sizin Rəbbiniz tərəfindən möcüzə gətirmişəm. Sizin üçün gildən quş şəkilli bir şey düzəldərəm, Allahın izni ilə anadangəlmə koru və cüzamı sağaldaram, ölüləri dirildərəm. Sizə yediklərinizdən və ehtiyat saxladıqlarınızdan xəbər verərəm. (Şübhəsiz, bunda sizin üçün ibrət var.”(٢

Peyğəmbərlər nəinki özbaşına şəfaət vermir, möcüzə göstərmir, hətta sözdə də Allahdan önə keçməyib Onun izni ilə danışırlar. Quranda buyurulur: “Danışıqda Ondan (önə keçməzlər, onun göstərişi ilə iş görərlər.”(٣

**Allah dostlarının şəfaətinin əhatəsi**

Şəfaət ilahi mərhəmət cilvələrindən biridir. Allah bəndələrini bağışlamaq istədiyindən Öz peyğəmbərləri və xüsusi övliyaları üçün şəfaət haqqı nəzərdə tutmuşdur. Onlar Allahın izni ilə insanlar üçün bağışlanma diləyir, şəfaətçi kimi çıxış edirlər. Beləcə, insanlar şəfaət yolu ilə Allahın mərhəmət nemətini dadırlar. Allah-təala öz peyğəmbərinə icazə vermişdir ki, ondan günahkarlar üçün bağışlanma diləsin: “Biz elə bir peyğəmbər göndərmədik ki, ona Allahın izni ilə itaət olunmasın. Onlar özlərinə sitəm qıldıqda sənin yanına gələr və



---

Bəqərə”, ٢٥٥“ [٣٨] -١

Ali-İmran”, ٤٩“ -٢

Ənbiya”, ٢٧“ [٤٠] -٣

Allahdan bağışlanma diləyərdilər. Peyğəmbər onlar üçün bağışlanma istəyərdi. (Şübhəsiz, Allahı tövbələri qəbul edən və mehriban görərlər."(١

Bəli, peyğəmbər Allahın izni və iradəsi əsasında günahkarlar üçün bağışlanma diləyir. Onlar öz istəklərini Allaha qəbul etdirmirlər. Peyğəmbər (s) və digər məsumlar sadəcə rəhmət qapısıdır. İnsanlar çətinlik çəkmədən onlara üz tutub təvəssül edə bilərlər. Allah da öz övliyalarına xüsusi diqqəti səbəbindən onların bağışlanma istəklərini qəbul .edər. Məsumların vasitəçiliyi ilə bəndələr Allahın mərhəmətindən faydalanar

Peyğəmbər (s) və digər imamlar Allahın izni olmadan şəfaət verə bilməzlər. Şəfaət şərtləri ödənmədikdə də şəfaət həyata keçmir. Şəfaətin əsas şərtlərindən biri xətaya yol vermiş insanın iman əhli olmasıdır. Yalnız möminlər şəfaətə nail olur. Amma müşrik və günah səbəbindən dünyadan imansız gedən insan şəfaətə nail olmur. Allah müşriklərə şəfaət edilməsinə icazə vermir: "Peyğəmbər və iman gətirənlərə yaraşmaz ki, cəhənnəm əhli olduqlarını bildikdən sonra müşriklər üçün bağışlanma diləsinlər. (Onlar qohum olsalar da belədir."(٢

Qurani-kərimdə bildirilir ki, həzrət İbrahim nə qədər ki, Azərin Allahla düşmənçiliyindən xəbərsiz idi, ona şəfaət vəd edirdi. Quranda buyurulur: "Tezliklə Rəbbimdən sənin üçün bağışlanma istəyərəm."(٣) Amma məsələdən xəbər tutan İbrahim Azər üçün bağışlanma diləmək fikrindən daşındı: " İbrahimin öz atası üçün bağışlanma istəyi yalnız bir vəd idi və Azərin Allaha düşmən olduğunu bildikdən sonra (ondan üz çevirdi. Həqiqətən, İbrahim canıyanan və dözümlü idi."(۴

Qeyd olunduğu kimi, şirkdən əlavə namazın tərki, namaza yüngül yanaşmaq kimi bəzi günahlar insanı övliyaların səh:٣٢

---

Nisa", ۶۴" [۴١]-١

Tövbə", ١١٣" [۴٢]-٢

Məryəm", ۴٨" [۴٣]-٣

Tövbə", ١١۴" [۴۴]-۴

şəfaətindən məhrum edir. İmam Sadiq (ə) bu barədə buyurur: "Namazı yüngül sayan (şəxs bizim şəfaətimizə nail olmaz."(١)

Qeyd etməliyik ki, insanı cəhənnəm odundan qurtaran şəfaət qiyamət aləminə aiddir. Günaha batıb dünya və bərzəx həyatında paklanmayanlar qiyamətdə Peyğəmbər (s) və məsumların şəfaətinə nail ola bilər. Xam qızıl kürədə qızdırılır ki, onun qatqıları təmizlənsin. Allah-təala bəzi möminləri çətinliyə salmaqla, onları yoxsulluq və xəstəliklə sınağa çəkməklə onların günahlarını təmizləyir. Belə ki, ilahi sınaqlardan üzü ağ çıxanlar pak qəlblə rahatca dünyasını dəyişir. Amma həmin məqamadək günahdan paklanmayanlar çətin can verir. Ruhun çətinliklə çıxması da insanın günahlarını yuyur. Amma bəziləri o qədər günaha yol verirlər ki, həmin iki mərhələdən sonra da günahdan təmizlənə bilmirlər. Nəticədə qəbr sıxıntısı vasitəsi ilə günahları yuyulur və bərzəx aləminə daxil olurlar. Bu üç mərhələdən sonra da günahları paklanmayan insan bərzəx aləmində əzab çəkməklə təmizlənir. Bərzəx əzabından sonra bir günahı qalarsa, qiyamət səhnəsinə daxil olur. Qiyamətdə Peyğəmbər (s) və məsum imamların .şəfaətinə nail olan kəs bağışlanıb kövsər hovuzuna varid olur

Bütün kamilliklərin kökü tövhiddə olduğu kimi, bir çox günahların da kökü şirkdədir. Bunu peyğəmbərlərin və keçmiş qövmlərin tarixi təsdiqləyir. Allah-təala qədim ümmətləri yol verdikləri şirkə görə cəzalandırır. Bu şirk bütpərəstlik və Allahdan qeyrisinə pərəstiş kimi aşkar şirkdir. Beləleri qəlblərində Allahdan qeyrilərini də müstəqil təsirə malik bilirlər. Hər halda şirk çoxlarının qəlbində kök atmışdır. Bu (səbəbdən Allah-təala buyurur: "Onların çoxu şərik qoşmamış Allaha iman gətirməz.(٢)

Xalis və düzgün iman əldə etmək üçün insan qəlbində şirkin köklərini qırmalıdır. Yalnız bundan sonra həqiqi tövhidə etiqad mümkündür. Bu etiqadın görüntülərindən biri budur ki, səh:٣٣

---

Biharul-ənvar", c. ٤٧, bab ١, s.٧, h. ٢٣" [٤٥] -١

Yusuf", ١٠٦" [٤٦] -٢

insan hətta Peyğəmbər (s) və məsum imamların müstəqil şəfaət qüdrətinə malik olmadığına inansın. Peyğəmbər (s) və imamların şəfaəti ilahi rəhmət üçün yalnız bir zəmindir. Yəni Allah öz bəndələrinə o qədər diqqətlidir ki, hətta şəxsən ləyaqəti olmayanları da bağışlayır. Beləları üçün Allah övliyaları vasitədir. Allah övliyalarının .duasına xatir belələrini bağışlayır. Əslində şəfaət yolunu açan Allah özüdür

**Yaranmışların Allah hüzurunda kiçikliyi**

Minacatın bu hissəsində Allah-təalanın işarə etdiyi ikinci məsələ hətta Peyğəmbər (s) kimi əziz bir yaranmışın Allah hüzurunda kiçik və ehtiyaclı olmasıdır. Hətta peyğəmbərlərin və mələklərin də müstəqil ixtiyarı yoxdur. Yalnız özü vasitəsiz bir şeyə malik olan izzət sahibidir. Amma hər şeyi Allah tərəfindən verilmiş və istənilən bir anda geri alına bilən kəs özünü izzətli saya bilməz. Beləları onların ixtiyarına verilmiş şeylərə görə öyünməməlidirlər. İnsanın vücudundan şirkin bütün təsirlərini pak edə biləcək bu mühüm prinsip ayə və rəvayətlərdə yetərincə işıqlandırılmışdır. Nümunə olaraq bir :neçə ayəni nəzərdən keçirək

(Allah məsəl çəkir: “Bir bəndədir ki, əlindən heç iş gəlməz.”(١ .١

(De ki, Allahın istədiyindən savayı özüm üçün faydam və zərərim yoxdur.”(٢“ .٢

Onun yerinə özlərinə bir məbudlar seçirlər ki, heç nə yaratmamışlar, özləri . ٣ yaranmışlar. Özlərinə nə ziyan edə bilər, nə də fayda verə bilərlər. Ölüm, həyat və (qiyamət əllərində deyil.”(٣

İnsan Allahı Onun istədiyi kimi tanıyıb, Onun varlığa mütləq hakim olduğuna inandıqdan sonra yalnız Ona itaət və səh:٣۴

---

Nəhl”, ٧۵“ [۴٧] -١

Ə’raf”, ١٨٨“ [۴٨] -٢

Fürqan”, ٣“ [۴٩] -٣

bəndəlik edir. Anlayır ki, heç nəyi yoxdur və yalnız Allahın istəyi ilə iş görür. Belə bir dindarlıq həqiqi dinə etiqaddan ibarətdir: “Pak və xalis ayin Allaha məxsusdur.”(١)

Deməm, insan öncə Allahı düzgün yolla və ilahi tövfiqlə tanımalıdır. O özünü Allahın vacib buyurduğu vəzifələrə məsul bilməli, Allahı tanımaqda səhlənkarlıq göstərməməlidir. İnsan dini tanımaq üçün həqiqi mənbələrə müraciət etməlidir. Eləcə də ehtiyatlı olmaq lazımdır ki, azğın nəfs düşüncəyə yol tapıb din haqqında yanlış təsəvvür yaratmasın. Allah və dini düzgün tanıdıqdan sonra Allahın buyuruqlarını yerinə yetirmək, bəndəlik vəzifələrinə münasibətdə süstlük göstərməmək lazımdır.

## Nəfsin hiylələri müqabilində ayıq olmaq lazımdır

Allah-təalanın həzrət Musaya müraciətində üçüncü mühüm nöqtə nəfsin ittiham edilməsidir. İnsan öz nəfsini qınayıb ona arxayın olmamalıdır. Bəli, azğın nəfs bəndəlik və ilahi təkliflərin icrası yolunda, Allah və dinlə tanışlıqda insanı aldada bilər. Nəfsin təlqinləri sayəsində insan həqiqəti təhrif olunmuş şəkildə tanıyıb doğru yoldan çıxa bilər. Allah-təala azğın nəfs istəklərinin təsiri altında doğru yoldan çıxan alimlər haqqında buyurur: “Azğın nəfsini özünə məbud edəni görmədinmi? Allah onu bilərəkdən azdırdı, qulağına və qəlbinə möhür vurdu, gözünə pərdə çəkdi. Allahdan savayı onu kim hidayət edəcək? Öyüd götürmürsünüz?!”(٢) İnsan nəfsini özünə məbud seçdikdən sonra onun qəlbinə, gözünə və qulağına pərdə çəkilir. Belə bir insan haqqı batildən seçə bilmir. Onun din haqqında anlayışları təhrif olunur. Deməm, insan həqiqi dini dərk etmək üçün öncə nəfs istəklərini nəzarətə almalı, nəfsin təsiri altına düşməməlidir. Bir çox əhvalatlarda həqiqi din alimlərinin nəfs istəklərini susdurması gözəl şəkildə



---

١- [٥٠] “Zumər”, ٣

٢- [٥١] “Casiyə”, ٢٣

bəyan olunmuşdur. Onlar dini məsələlər haqqında qərar çıxararkən nəfsin təsirindən qurtulmağa müvəffəq olmuşlar. Mərhum Əllamə Hilli haqqında belə nəql edirlər: Bir gün alim murdarlanmış quyunun paka çıxarılması məsələsini araşdırırmış. Müəyyənləşdirmək istəyirmiş ki, quyunun paka çıxması üçün ondan nə qədər su çəkilməlidir. Həmin vaxt alimin həyətində quyu olmuşdur. Öz quyusuna xatir asan hökmə meyl etməmək üçün mərhum Hilli həmin quyunun doldurulmasını göstəriş !vermişdir. Bəli, quyu olmayan yerdə nəfs istəklərinin qorxusu yox idi

İnsan bəzən müəyyən mənafe və ya zərərlərə görə dinə münasibətini dəyişir, onun düşüncəsi təsir altına düşür. Yüksək ixlas mərtəbəsinə çatmış alimlər həqiqətin üzə çıxarılması yolunda nəfs istəklərini susdurmuş, müəyyən məhrumiyyətlər yaşamışlar. .Onların əsas məqsədi din haqqında düzgün qənaətə gəlmək olmuşdur

Deyildiyi kimi, nəfsin ittihamı və onun nəzarət altında saxlanılması təkcə dinlə tanışlıq mərhələsinə aid deyil. Dini tanıdıqdan sonra da nəfs öz işini görə bilər. İnsan çalışmalıdır ki, dini vəzifələrini yalnız Allahın razılığı üçün yerinə yetirib xoşbəxtlik və kamala çatsın. Nəfs ilahi vəzifələrə əməl məqamında insana çox xəyanət edir. O insanı riyakarlığa, şöhrətpərəstliyə, məqampərəstliyə sürükləməklə onun ixlasını əlindən alır. Əlbəttə belə bir görüntü yaradır ki, bütün işlər Allaha xatir görülüb. Bəziləri əməldəki riyakarlığı görməyə də bilər. Amma nəfsini tərbiyə edənlər əməlin Allah xatirinə olub olmadığını yaxşı anlayır. Hər hansı sahədə bilik qazanan insan özünü təmənnasız göstərsə də, nəfs istəklərinin təsiri altında ola bilər. Bəziləri zahirdə Allahın razılığı üçün .çalışdığını nümayişə qoyur, amma daxildə ad-san və məqam üçün tər tökür

İnsan özünü aldatmamalıdır. İnsan atdığı addımların və fəaliyyətlərinin, hətta dini xidmətlərinin Allaha xatir olub-olmadığını müəyyənləşdirmək üçün özünü sınağa .çəkməlidir

Yalnız bundan sonra hansı həddə səmimi olduğu üzə çıxır. Məsələn, sinifdə müəllimə tez-tez sual verən şagird öz hərəkətlərinin səbəbini araşdırmalıdır. Olmazmı ki, həmin suallar dərsdən sonra ünvanlansın? Bəziləri deyə bilərlər ki, dərsdən sonra müəllimi saxlamaq çətin olur. Başqa bir sual yaranır: Nə üçün müəllim sualı cavablandırdıqdan sonra şagird onunla razılaşmaq istəmir? Görəsən onun məqsədi özünü elmli göstərmək deyil? Həqiqəti üzə çıxarmaq naminə mübahisə edən insan qarşı tərəfin yetərli dəlillərindən sonra inadkarlıq göstərmir, düz mövqe tutmadığını etiraf edir. Gördüyümüz bir çox işlər insanların diqqətini cəlb etməyə xatirdir. Sadəcə bu məqsədimizi müxtəlif yollarla pərdələyirik. Bəli, insan onu hərəkətə gətirən amillərə diqqətli olmalıdır. Psixoloji zədələrlə bağlı aparılan tədqiqatlardan sonra aydın olmuşdur ki, bəzən insan qəlbinin dərinliyində mənfi niyyətlər gizlənir. Nəfs min yolla bu niyyətləri gizləməyə çalışır. Bu səbəbdən də özünütanıma və özünütərbiyə üçün .insan uyğun təcrübələrdən istifadə etməlidir

Aydın oldu ki, nəfs insanı iki yolla aldadır. O ilk addımda həqiqətləri təhrif olunmuş şəkildə göstərib, insanı ilahi mərifətdən məhrum etməyə çalışır. Onun ikinci işi insanın ixlasını, səmimiyyətini, işi Allaha xatir görməsini əlindən almasıdır. İnsanın niyyəti qeyri-ilahi olduqda Allah tərəfindən qəbul edilmir. Qeyd etməliyik ki, Allah-təala şirk qatqılı əməli də rədd edir. Yəni həm başqalarına xatir görülən iş, həm də Allahla yanaşı başqalarına xatir görülən iş məqbul deyil. İmam Sadiq (ə) buyurur: Allah-təala buyurur: “Ən üstün şərik mənəm. Öz əməlində başqasını mənə şərik qoşanın (başqasının razılığını güdənin) əməlini qəbul etmərəm. (Onu həmin şərikin ixtiyarına verərəm.) (Yalnız mənə görə yerinə yetirilən əməl başqadır (mənim tərəfimdən qəbul olunur).”(١)

Demək, həm həqiqətlərlə tanışlıqda, həm də öz rəftarlarımızda nəfsə diqqətli olmalıyıq. Çünki nəfs insanı səh:٣٧

---

Biharul-ənvar”, c. ٧, bab ٥۴, s. ٢۴٣, h. ١٥“ [٥٢] -١

müxtəlif yollarla aldadır, həqiqətlərlə tanışlığa mane olur. O həm də qeyri-ilahi niyyətləri meydana çəkir. Əxlaq alimləri nəfsin hiylələrini nəzərə alaraq insanın özünü .tərbiyə edib səmimi addım ata bilməsi üçün müxtəlif yollar göstərir

### Başqaları ilə müşavirə meyarı

Allah-təalanın həzrət Musaya dördüncü tövsiyəsi budur ki, insan öz dininə münasibətdə hətta övladına etimad göstərməsin. Yalnız xeyir işlər görən, salehlərlə dost olan övlad istisnadır. Dini düzgün anlamaq üçün ilk növbədə düşüncədəki vəsvəsələrlə mübarizə aparmaq lazım gəlir. O bu yolla yəqinlik əldə etməlidir. Dini hökmləri qavramaq və mövzuları müəyyənləşdirmək üçün yetərincə araşdırma aparmalı, şərti dəlillər tapmalıdır. Bu işdə başqalarına etimad etməməyə çalışmaq lazımdır. Qəti fikrə gələ bilmədikdə təbii ki, başqaları ilə məşvərətə ehtiyac yaranır. Belə məqamda insan başqalarının baxışlarından istifadə etməklə öz mövqeyini müəyyənləşdirir. Əlbəttə ki, belə məqamlarda xeyirxah insanlarla məsləhətləşməyə səy göstərilir. Ata və övladlar insana ən yaxın fərdlərdir. Onların elmi və əxlaqi səlahiyyəti olduqda başqalarından daha önəmlidirlər. Övladın başqa saleh insanları sevməsi onun özünün salehliyini göstərir. Amma bir qrup xeyirxah insanı dost bilib Allahı nəzərə almayan və öz səliqəsi əsasında əməl edən şəxslə məsləhətləşmək olmaz. Məsləhət üçün tərəf saxlamadan haqqa əsaslananlar daha layiqlidirlər. Bəli, öz ziddinə olsa belə haqqı dəstəkləyən insanlar var. Amma xeyirxah insanları sevdiyi halda öz istəklərinə üstünlük verənlərlə məsləhətdən çəkinmək lazımdır. Belələri ilahi .məntiqə sığmayan fikirlərini daha üstün tuta bilərlər

## Dördüncü məclis

### İlahi buyuruqda ictimai rabitələrin islahı

Ey Musa! Özünü pakla qüsl et, sonra mənim saleh bəndələrimə yaxınlaş. Ey Musa! Namazlarında onlara imam, ixtilaflarında hakim ol. Aralarında sənə nazil etdiyim kitab əsasında mühakimə apar. Həqiqətən, mən o kitabı (Tövratı) aşkar hökm, aydınladan dəlil, olmuşları və olacaqları bəyan edən nur olaraq nazil etdim."

### Saleh insanlar və saleh cəmiyyətlə rabitənin zərurəti

İnsan ictimai bir varlıqdır. Onun həyatı başqaları ilə rabitələrsiz ötüşmür. Allah-təala insanı öz həmnövləri ilə maddi və mənəvi rabitələrə ehtiyaclı xəlq etmişdir. Tənha, cəmiyyətdən uzaq yaşamaq istəyən insan nə maddi, nə də mənəvi baxımdan inkişaf edə bilər. Çünki maddi həyat başqalarının elm və təcrübəsindən istifadə ilə davam edir. İnsan dini məclislərdə iştirak etmədən, moizə və nəsihətlərdən faydalanmadan mənəvi baxımdan inkişaf edə bilmir. Deməli, mənəvi baxımdan təkamül üçün də ictimai rabitələrə ehtiyac var. İnsanlar ictimai rabitələri qırıb həmkarlıqdan çəkinsələr hansısa mənəvi təkamüldən danışmağa dəyməz. Şübhəsiz ki, əgər cəmiyyətdə saleh insanlar varsa ictimai rabitələr faydalıdır. Saleh insanlarla rabitələr gücləndikcə insan kamilləşir.

Kimsə öz həyatını tənhalıqda keçirə bilmir. O ictimai rabitələrə qatılmağa məcburdur. Təbii ki, cəmiyyətdəki fərdlər əxlaq və etiqad baxımından eyni səviyyədə olmur. Cəmiyyəti ümumi şəkildə iki qrupa bölmək olar: Allaha bəndəlik yolunu tutub onun razılığına uyğun yaşayanlar və dini dəyərlərə biganə insanlar. İkinci qrupdan olanlar zahirən dini prinsipləri qəbul etsələr də dünyaya bağlılıq səbəbindən həyatlarında dini

ölçüləri gözləmirlər. Onlar bəzən rəsmi şəkildə haqlı olmadıqlarını etiraf edir, bəzən də .öz etiqad və əməllərinə don geyindirməyə çalışırlar

Əksər insanların saleh olmadığını və saleh insanların azğınlığını nəzərə alaraq saleh olmaq istəyənlər, ilahi dəyərlərə əməl etməyə çalışanlar, Allaha yaxınlaşmaq əzmində olanlar üç yoldan birini seçməlidir. Birinci yol budur ki, insan yalnız zəruri məqamlarda cəmiyyətlə rabitə saxlayıb, imkan həddində bu rabitələrdən çəkinsin. İkinci yol budur ki, bütün ətrafla rabitəyə qatılıb hər addımda özünü azğınlıqdan gözləsin. Üçüncü yol budur ki, insan saleh insanlarla rabitə saxlasın. Ən münasib yol da budur. Bu yolu seçən insan saleh insanlarla rabitəyə önəm verir, başqaları ilə yalnız zəruri hallarda və .onların təlim-tərbiyəsi məqsədi ilə görüşür

**Rahiblik və guşənişinliyin səbəbi**

Tarixi məlumatlara, eləcə də ayə və rəvayətlərə əsasən həzrət İsanın səhabələri və yaxınları rahiblik yolunu tutmuşdular. Onlar guşənişinliyi bir dəyər sayır və imkan həddində cəmiyyətdən uzaqlaşmağa çalışırdılar. Səhabələr şəhərdən uzaqlaşıb biyabanlarda, mağaralarda ibadətə məşğul olurdular. Qurani-kərimdə məsihilərin rahibliyə meyli haqqında buyurulur: “Özbaşına seçdikləri tərkidünyalıq yolunu onlar üçün biz müəyyənləşdirməmişdik. Bunu Allah rizasına etsələr də, layiqincə (gözləmədilər.”(١

Bu gün məsihi dünyası güclü şəkildə dünya həyatına bağlandığından rahibliyə meyl zəifləmişdir. Amma məsihi məmləkətlərinin müəyyən nöqtələrində hələ də rahiblik müşahidə olunur. Rahiblər cəmiyyətdən kənarlaşaraq ömürlərini tənhalıqda keçirirlər. Xaricə səfərlərindən birində bir qrup məsihi ilə görüşdüm. Onlar bildirdilər ki, yaxınlıqda monastrda yaşayan rahiblər daim ibadətə məşğuldurlar və səh:۴۰

---

Hədid”, ۲۷“ [۵۳] -۱

bayıra çıxmırlar. Onlar nə qəzet oxuyur, nə televizora baxır, nə də radioya qulaq asırlar. Demək olar ki, monastrdan kənarda baş verənlərdən xəbərsizdirlər. Məsihi dünyasında rahiblərin monastrda yaşayıb arabir cəmiyyətdə görünməsi adi bir işdir. Rahiblərin öz ömrünün ۲۰-۳۰ ilini monastrda yaşayıb dünyadan xəbərsiz qalması təəccüblü görünür. Təbii ki, onların məqsədi özlərini mömin göstərmək deyil. Əgər rahiblər üçün cəmiyyətin münasibəti əsas olsaydı, arabir bayıra çıxıb özlərini tanıtdırardılar. Beləlləri sadəcə məsihi ayinlərini yerinə yetirməklə Allaha yaxınlaşmaq məqsədindədirlər. Onların nəzərincə, yalnız rahiblik və dünyadan uzaqlaşmaqla Allaha .yaxınlaşmaq mümkündür

Müsəlmanlar arasında da rahiblik yolunu tutub tərki dünya olanlar var. Onlar guşənişinliyi ictimai rabitələrdən üstün tuturlar. Bəzi çaşqın firqələr və sufilər də düşüncə və əməldə cəmiyyətdən kənarlığa üstünlük vermişlər. Nəticədə ictimai-siyasi vəzifələrə əməl olunmur, müsəlmanlar və İslam düşmənləri qarşısındakı vəzifələr öhdədən atılır. Beləlləri nəinki düşmənlə mübarizə meydanına daxil olmur, hətta öz yanlış düşüncələri ilə İslamı təhrif edirlər. Onlar öz baxışlarına don geyindirmək üçün bir çox rəvayətləri, xüsusi ilə dünyanın sonu ilə bağlı hədisləri əldə bəhanə tuturlar. Həmin rəvayətlərdə buyurulur ki, son dövrdə aləmi bürüyəcək fəsadlardan amanda qalmaq üçün cəmiyyətdən kənarlaşmaq lazımdır. Məsələn, imam Sadiqdən (ə) belə bir rəvayət nəql olunur: "Evlərinizin döşənəcəyi olun." (Yəni cəmiyyətə qatılmaqdan (çəkinib evlərinizdə qalın).(۱)



---

Biharul-ənvar", c. ۵۲, bab ۲۲, s. ۱۳۸, h. ۴۳" [۵۴] -۱

Görən öncə nəql etdiyimiz rəvayət və bu mövzuda nəql olunmuş bir sıra qüdsi hədislər bütün dövrə aiddir, yoxsa xüsusi şəraitlər üçün nəzərdə tutulmuşdur? Doğrudanmı bütün hallarda möminlər öz əqidə və əxlaqlarını qorumaq üçün kənara çəkilməlidirlər? Doğrudanmı, İslam özünü tərbiyələndirib Allah yolunu tutmaq istəyənlərə cəmiyyətdən uzaqlaşmaq göstərişi vermişdir? Ola bilərmi ki, İslam ictimai rabitələri tövsiyə edərkən saleh insanları günahkarlardan fərqləndirməsin? Günahdan qorunmaq tapşırıldığı halda günahkarla rabitələrin tövsiyə olunması mümkündürmü? Bəlkə İslam həzrət Musanın şəriətində və Əhli-beyt (ə) rəvayətlərində bəyan olunduğu kimi üçüncü bir yolu tövsiyə edir? Bəli, möminləri saleh insanlarla rabitəyə, günahkarlardan çəkinməyə çağıran üçüncü bir yol da var. Yəni saleh olmayanlarla yalnız zəruri həddə və onların hidayəti məqsədi ilə rabitələrə qatılmaq olar. Olsun ki, saleh olmayan fərdlər ətrafdakıların köməyinə ehtiyac duysun. Mömin müsəlman nəinki ehtiyaclılara, hətta savaş məqsədində olmayan kafirlərə əl tuta bilər. Qurani-kərimdə də bu nöqtəyə toxunulmuşdur: “Allah sizi dində sizinlə vuruşmayan, sizi məskənlərinizdən çıxarmayan kəslərə yaxşılıqdan, onlarla ədalətli rəftardan çəkindirmir. Allah ədalətliləri sevir.”(١)

Ayədə həzrət Musanın şəriətində və İslamda göstərilən yol təsdiqlənir. Şübhəsiz ki, məsihiliyin başlanğıcında, həzrət İsanın besəti dövründə belə bir yol doğru sayılmışdır. Rahiblik xüsusi və təhlükəli şəraitdə həzrət İsanın ardıcılları üçün nəzərdə tutulmuş bir yol idi. Çünki bu zümrə yəhudilər tərəfindən ciddi təzyiqlərə məruz qalır və əzab-əziyyətdən yaxa qurtarmaq üçün cəmiyyətdən uzaqlaşırdılar. Həzrət İsanın ardıcılları müşrik və yəhudi cəmiyyətdən uzaqlaşmağa məcbur idilər. Amma zaman keçdikcə bütün şəraitlərdə uyğun həyat



---

١- [۵۵] “Mumtəhinə”, ٨

tərzinə üstünlük verildi. Bir qrup məsihi təhlükəli dövr başa çatdıqdan sonra da .tərkidünyalıq yolunu seçdi

Qeyd etdik ki, Allah-təala günahkarlarla münasibətdə rabitələrə hədd qoyulmasını tapşırır. Möminlərə əmr edilir ki, saleh insanlarla yaxınlıq etsinlər. Çünki ətrafdakılarla ünsiyyət insanların əxlaq və əməlinə, hətta etiqadına təsirlidir. Bu əsasla həzrət Peyğəmbər (s) buyurur: "İnsan öz dostunun dinindədir. Hər biriniz kiminlə dost (olduğunuza baxın."(١

Həzrət digər bir məqamda kiminlə dostluğun faydalı olduğunu açıqlayır: "Bir şəxs ki, onunla görüş sizə Allahı xatırlatsın, onun sözləri elminizi artırsın və əməli axirəti yadınıza salsın."(٢) Həzrət Peyğəmbər (s) möminlərin məclisi haqqında buyurur: "Nə vaxt behişt bağlarından bir bağ görsəniz bu bağı dolanın ... həmin bağ möminlərin (məclisidir."(٣

Bəli, elə bir insanla rabitədə olmaq lazımdır ki, bu rabitə sizin kamilliyiniz və Allaha yaxınlaşmağınız üçün faydalı olsun. İnsanı dünyaya rəğbətləndirən, ona Allahı unutduran, ilahi göstərişləri pozmağa çağıran kəslərlə yaxınlıq yalnız Allahın qəzəbi və əbədi peşmançılıqla sonuclanır. Allah-təala günahkarlarla yoldaşlıq edənlərin acı aqibəti haqqında buyurur: "Bir gün sitəmkar şəxs əllərini dişləyib deyər: "Ey kaş Peyğəmbərlə (s) yol seçəydim. Vay olsun mənə, kaş filankəslə dost olmayaydım. O (məni azdırdı, hansı ki öncə Quranı tanımışdım. Şeytan daim insanı alçaldır."(۴



---

Biharul-ənvar", c. ۷۴, bab ۱۴, s. ۱۹۲, h. ۱۲" [۵۶] -۱

Biharul-ənvar", c. ۷۴, bab ۱۳, s. ۱۸۶, h. ۳" [۵۷] -۲

Həmin mənbə, s. ۱۸۸, h. ۱۳ [۵۸] -۳

Fürqan", ۲۷, ۲۸" [۵۹] -۴

Bəli, saleh olmayan insanlarla yaxınlıq Allahı unutdurur, insanın əqidəsini süstləşdirir. Zəif iradəli insanlar yaxınlıq etdikləri fərdlərin rəngini götürür, onlarla həmxasiyyət olur. Belələri hər ünsiyyətdən sonra başqalaşır. Amma unutmamalıyıq ki, şəxsiyyətli və iradəli insanlar da büdrəmədən amanda deyil. Onlar da günahkarlarla ardıcıl ünsiyyətdə olduqda tədricən təsirə məruz qalır. Ardıcıl şəkildə qeyri-saleh dairələrə qatılanlar nəhayətdə simasını dəyişir. Deyirlər bir abid dolanışıq üçün öz qoyununun südündən istifadə edirdi. İki şəxs bu qoyunu oğurlamaq qərarına gəldi. Onlar bu məqsədlərini həyata keçirmək üçün plan cızdılar. Birinci oğru abidin yanına gəlib salam verdi və dedi: “Mən təəccüb edirəm ki, sizin kimi bir abid qapısında donuz saxlayır.” Abid dedi: “Bu donuz deyil, qoyundur. Birinci oğru gedəndən sonra ikinci oğru abidə yaxınlaşdı. Salam verib dedi: “Necə olur ki, sizin kimi bir abid donuz saxlayır?” İkinci oğrunun sözlərindən sonra abid şəkkə düşdü. Düşündü ki, bəlkə o yanılıb donuzu qoyun sayıb və onun südündən istifadə edib. Nəhayət, bu şübhələrdən qurtarmaq .üçün qoyunu küçəyə buraxdı və oğrular rahatlıqla öz məqsədlərinə çatdılar

İnsan öz etiqadlarına nə qədər bağlı olsa da, başqalarının uyğun əqidəyə qarşı ardıcıl şəkildə şübhə yaratmaq cəhdləri öz təsirini göstərir. İnsan tədricən tərəddüdə düşür. Bu səbəbdən də Qurani-kərim möminləri azğınlarla ünsiyyətdən çəkindirir: “Allah öz kitabında sizin üçün nazil edib ki, Allahın ayələrini inkar edib rişğəndə qoyduqlarını eşidirsinizsə, söhbəti dəyişənədək onlarla əyləşməyin. Çünki bu halda siz də onlar kimi olacaqsınız ...”(١) Əqidəsində dağ kimi insanlar çox azdır. Onların bəsirəti o qədər güclüdür ki, azğınların şübhə yaradan danışıqları onlara təsir etmir. İnsanların əksəri isə asanlıqla təsir altına düşür. Başlanğıcda şübhələri qəbul etməyən adi insanlar



---

Nisa”, ۱۴۰“ [۶۰] -۱

bu şübhələr təkrarlandıqda təslim olurlar. Əgər şübhələr saxta dəlillər və aldadıcı zövqlə təqdim olunursa, qarşı tərəf bir anda ovsunlanır. İmam Hadi (ə) sözün təsiri ilə bağlı buyurur: “ Danışanı dinləyən ona bəndəlik etmişdir. Əgər danışan Allahın sözünü danışırsa, dinləyən də Allaha bəndə olur. Əgər danışan şeytanın dilindən danışırsa (dinləyən də şeytana bəndəlik edir.”(١

Təcrübədə dəfələrlə müşahidə etmişik ki, ardıcıl vəsvəsələr insanın daxilində şübhə yaradır. Yəni birinci dəfə bəyan olunan şübhə təsirsiz olursa da, eyni şübhə təkrarlandıqda insan əminliyini itirir. Bu səbəbdən də Allah-təala həzrət Musaya əmr edir ki, mənə ibadətdə şərik qoşma. Sonra əmr olunur ki, salehlərlə ünsiyyətdə ol, günahkarlarla ünsiyyətdən çəkin. Əslində bütün bu tövsiyələr bizə ünvanlanmışdır. Çünki həzrət Musa məsum idi və günahkarlarla rabitə saxlamırdı. Uyğun öyüdlər məsələnin ciddi olduğunu göstərir. Araşdırsaq görərik ki, bir çox mənəvi tərəqqi və tənəzzüllər ən yaxın dostumuzun təsirindən qaynaqlanır. Demək, dost seçimində diqqətli olmalı, Allahı yada salan dostlarla ünsiyyət saxlamalıyıq. Daim dünyadan .danışan, insanı dünyaya rəğbətləndirən insanlarla ünsiyyətdən çəkinmək lazımdır

## Xalqla ünsiyyətin əsas şərtləri

a) Zahiri və batini gözəlliyə riayət

Aydın oldu ki, tənhalıq və guşənişinlik İslam baxımından məqbul deyil. Allah orta bir yol təqdim edir. Bu yolu seçən insan ilk addımda salehlərlə ünsiyyətə qatılır və ən zəruri hallarda saleh olmayan insanlarla ünsiyyət saxlayır. İkinci zümrə ilə rabitədə məqsəd onların hidayətidir. Təbii ki, saleh insanlarla rabitə qurmaq qərarına gəlmiş insan ilk növbədə onları tanıya bilməlidir. İkinci addımda salehlərin diqqətini cəlb edəcək zəmin hazırlanmalıdır. Sonda isə nəzərdə tutulmuş



---

Biharul-ənvar”, c. ۲, bab ۱۴, s. ۹۴, h. ۳۰“ [۶۱] -۱

rabitələr qurulur. Allah-təala saleh insanlarla ünsiyyət üçün iki şərt bəyan edir: Birinci şərt budur: “Ey Musa! Özünü pakla, qüsl et, sonra mənim saleh bəndələrimə yaxınlaş.” Saleh insanlarla rabitənin birinci şərti insanın cismani təmizliyidir. Çünki insanlar libası çirkli və pinti fərdlərlə ünsiyyətdən qaçır. Amma təkcə yuyunmaqla kifayətlənmək olmaz. Yuyunmaqla yanaşı ibadi baxımdan, Allah xatirinə paklanmaq lazımdır. Bu səbəbdən də müraciətdə həm cismən təmizlənmək, həm də Allaha yaxınlaşmaq məqsədi ilə qüsl etmək tapşırılır. Qüsl vasitəsi ilə insanın batini təmizlənir, salehlərlə .ünsiyyətə qatılmaq üçün ruhi hazırlıq yaranır

İslam təmiz geyinməyi, saçları qaydaya salmağı, dişləri yumağı, ətir vurmağı tapşırmaqla möminlərin xoş sima ilə cəmiyyətdə görünməsini nəzərdə tutur. Bu şərtlərə əməl olunduqda ətrafdakılar insanla rabitəyə maraq göstərir. Əziz İslam peyğəmbəri (s) zahiri səliqəsinə və təmizliyinə xüsusi diqqət yetirmiş, ətirlənmişdir. Evdən bayıra çıxanda libasını səliqəyə salmış, saçlarını daramışdır. Peyğəmbər (s) .güzgü olmadıqda suya baxıb saçını və saqqalını qaydaya salmışdır

Ətrafdakılarla ünsiyyətdə zahirən səliqəli olmaq hamı üçün zəruridir və təkcə möminlərə aid deyil. Möminlər üçün mühüm və dəyərli sayılan budur ki, zahiri gözəlliklə yanaşı batini gözəlliyə nail olsunlar. Salehlərlə ünsiyyətə qatılmaq üçün ibadət məqsədi ilə yuyunmaq lazımdır ki, bu iş batinə təsir göstərsin və nəticədə saleh .bəndələrlə rabitəyə qatılan insan daha çox nuraniyyət əldə etsin

b) Xalqın hidayəti və insanlar arasında mühakimə

Həzrət Musanın cəmiyyət namazına imaməti, ixtilafların həllində hakim olması salehlərlə ünsiyyət üçün ikinci əsas şərt kimi bəyan olunur. Həzrət Musaya Allahın elçisi olaraq iki mühüm ictimai vəzifə tapşırılır. Birinci ictimai vəzifə insanların birlikdə ibadətə təşviqi və cəmiyyət namazında imamətin öhdəyə götürülməsidir. Bu yön ibadi və ictimai bir yöndür. İnsanların rabitələrində dünyəvi rabitələr mühüm yer 

tutduğundan və onlar dünyəvi ehtiyaclarını təmin etmək üçün cəmiyyətə qatılmağa məcbur olduqlarından istər-istəməz arada qarşıdurmalar yaranır. Bu səbəbdən də Allah-təala ikinci vəzifə olaraq Musaya imamət, hökumət və xalq arasında hakimlik vəzifəsini tapşırır. Ona əmr olunur ki, insanlar arasındakı ixtilafları həll etsin. Təbii ki, ailədə və cəmiyyətdə fərdlər arasında ixtilaflar yaranır və bu ixtilafların həllini kimsə öz öhdəsinə götürməlidir. Bu işi kimsə öz öhdəsinə götürməsə ictimai asayiş üçün təhlükə .yaranar

Hökumət səlahiyyətlərindən olan mühakimə vəzifəsinin həzrət Musaya tapşırılması cəmiyyətin hakimiyyətə olan həyati ehtiyacından danışır. Cəmiyyət bütün yönümlərdə tədbir və idarəçiliyə möhtacdır. Bəli, Allah-təala xalq üzərində hakimiyyəti peyğəmbərlərin və ilahi rəhbərlərin vəzifəsi kimi təqdim edir. Xalq arasında mühakimə məsuliyyəti də Allah elçilərinin vəzifəsidir. Onlar tədbir görmək, normalar müəyyənləşdirməklə yanaşı insanlar arasında ixtilafların həlli ilə məşğul olmalıdırlar. Allah-təala həzrət Musaya xitabən buyurur ki, namazlarında onlara imam, ixtilaflarında hakim ol. Məlum olur ki, qədim şəriətlərdə də ibadi məsuliyyətlərlə yanaşı dövlətçilik məsuliyyətləri olmuşdur. Peyğəmbərlər insanların həm ibadi, həm də ictimai .ehtiyaclarını təmin etməli idilər

## Həzrət Musanın mühakimə və hökumət kitabı

Təbii ki, insanlar arasında mühakimə hansısa qanun əsasında aparılmalıdır. Həzrət Musa Allahın elçisi olduğundan bu işdə ilahi göstərişlərə əsaslanmalı idi. O öz düşüncə və istəyi əsasında mühakimə apara bilməzdi. Buna görə də Allah-təala Musaya xitabən buyurur: “Aralarında sənə nazil etdiyim kitab əsasında mühakimə apar.” Musaya nazil olmuş kitab Tövrat idi. Həzrət Musa xalqı Tövrata dəvət etməli və bu kitab əsasında hökm verməli idi. Ona Tur dağında qırx günlük ibadətindən sonra Tövrat nazil oldu. Bu kitabda həzrət Musanın şəriət

hökmləri bəyan olunmuşdu. Quran və rəvayətlərə əsasən bu kitab lövhələr şəklində bir başa nazil olmuşdu. Bu kitabda Bəni-İsrailin, həzrət Musa dövrünün və ondan sonrakı insanların həzrət İsanın besətinədək ehtiyac duyduğu qanunlar əks olunmuşdu. Qurani-kərimdə bu barədə buyurulur: “Onun üçün həmin lövhələrdə hər bir öyüdü və hər bir şərhi yazdıq. (Dedik ki,) ondan möhkəm tut və qövmünə də onun (ən üstününü öyrənməyi tapşır. Tezliklə sizə fasiqlərin yerini göstərərəm.”(١)

İmam Sadiq (ə) həzrət Musaya nazil olmuş Tövrat və lövhələr haqqında buyurur: “Cəfr elmində müşahidə etmişəm ki, Allah-təala Musaya lövhələr nazil etdi və bu lövhələrdə olmuşlar və qiyamətədək olacaqlar bəyan olunmuşdu. Həzrət Musanın risaləti sona yaxınlaşanda Allah ona vəhy etdi ki, behişt zəbərcədindən hazırlanmış lövhələri Zinət dağında əmanət qoysun. Həzrət Musa həmin dağa gedəndə dağ yarıldı və o lövhələri dağdakı yarığa qoydu. İslam peyğəmbərinin (s) besətinədək lövhələr dağda qaldı. Peyğəmbərlə (s) görüş üçün Mədinəyə üz tutmuş Yəmən əhli həmin dağa çatanda qəfildən dağ yarıldı və həmin lövhələr göründü. Karvan əhli lövhələri götürüb yoluna davam etdi. Onlara ilham olunmuşdu ki lövhələrə baxmasınlar. Cəbrail də öz növbəsində əhvalatı Peyğəmbərə (s) xəbər vermişdi. Karvan əhli Peyğəmbərlə (s) görüşəndən sonra həzrət onlardan lövhə haqqında soruşdu. Onlar dedilər: “Bunu sizə kim xəbər verdi?” Həzrət buyurdu: “Allah-təala məni xəbərdar etdi.” Onlar dedilər: “Biz şəhadət veririk ki, sən Allahın rəsulusan.” Sonra lövhələri həzrətə təqdim etdilər. Həzrət Peyğəmbər (s) təbərani dilində yazılmış lövhələri oxuyub Əmirəl-mömінini (ə) çağırdı və buyurdu: “Al bu lövhələri. Onlarda keçmişlərin və gələcəyin elmi var. Bunlar həzrət Musanın lövhələridir. Allah mənə əmr edib ki, onları sənə tapşırım. Əmirəl-möminin (ə) buyurdu: “Mən onları oxuya bilmirəm.” Həzrət (s) buyurdu: “Cəbrail buyurub ki, bu gecə



---

١- [۶۲] “Ə’raf”, ۱۴۵

onları başının altına qoyasan. Səhəri gün onlardan agah olacaqsan.” Əmirəl-möminin (ə) buyurur ki, mən gecə lövhələri başımın altına qoydum. Səhəri gün Allah-təala məni bu lövhələrdən agah etdi. Peyğəmbər (s) buyurdu ki, onlardan bir nüsxə hazırlayım. Mən ondan bir nüsxə hazırladım. Həmin nüsxə hazırkı cəfrdir. Orada keçmişlərin və gələcəyin elmi var. Həmin nüsxə, lövhələr və Musanın əsası bizdədir...”(١)

Deyildiyi kimi Tövrat və lövhələr həzrət Musaya bir dəfəyə nazil oldu. Olsun ki, şəriət hökmləri və qanunları yalnız həzrət Musaya bütövlükdə nazil olmuşdur. İslamın zühurundan sonra Quran ayələri tədricən, müxtəlif məqamlarda, ٢٣ il ərzində nazil oldu: “Quranı hissə-hissə nazil etdik ki, onları xalqa aram oxuyasan. Onu tədricən nazil etdik.”(٢)

### Şəri hökmlərin dəyişməzliyi

Bu qüdsi hədisdə Allah-təala həzrət Musanı həzrət İsa və həzrət Məhəmmədin (s) besəti ilə müjdələyir və onların bəzi xüsusiyyətlərini sadalayır. Bu müjdə və xəbərdarlıq həzrət İsanın zühurunadək həzrət Musa şəriətinin mötəbərliyini göstərir. Bəni-İsrail həzrət Musadan sonra həzrət İsaya iman gətirməli idi. Beləcə son Peyğəmbərin (s) besəti ilə həzrət İsanın şəriəti gücdən düşürdü. Son Peyğəmbərin (s) ayinlərinə tabeçilik hamının vəzifəsi idi. “(Tövratı) Olmuşları və olacaqları bəyan edən nur olaraq nazil etdim” cümləsi isə şəriət prinsiplərinin eyni olduğunu göstərən ayələri təsdiqləyir. Həzrət Nuh, İbrahim, Musa, İsa və son Peyğəmbərə (s) nazil olmuş şəriətlər prinsipcə fərqlənmir. Şəriətlər yalnız cüzi məsələlərdə fərqlidir. Şərait və zamanın tələbindən asılı olaraq müəyyən cüzi hökmlər dəyişilmişdir. Məsələn, Bəni-İsrail itaətsizlik göstərdiyindən Allah-təala onlara öncə halal sayılan bəzi şeyləri haram buyurmuşdur. Onlar bu yolla tənbeh



---

١- [٦٣] Hüveyzi, “Təfsiri-nurus-səqəleyn”

٢- [٦٤] “İsra”, ١٠٦

olunmuşlar. Quranda oxuyuruq: “Yəhudilər yol verdikləri zülmə və çoxlarını Allah yolundan ayırdıqlarına görə onlara öncə halal olmuş bir çox pak şeyləri haram buyurduq.”(۱) Həzrət İsa məbus edildikdən sonra Bəni-İsarilə haram edilmiş bəzi şeylər yenidən halal olundu: “Qarşımdakı Tövrata inanmışam və gəlmişəm ki, sizə haram buyurulmuş bəzi şeyləri yenidən halal edəm. Yanınıza Rəbbimdən nişanə ilə gəlmişəm, Allahdan qorxun və mənə itaət edin.”(۲)

Şəriətlər əqidə, əhkam və əxlaq prinsipləri baxımından müştərəkdir. Bu prinsiplər bütün mütəfəkkirlər tərəfindən qəbul olunur. Dinlərdə təsbit olunmuş əxlaqi dəyərlər ağıl tərəfindən təsdiqlənir. Əlbəttə ki, ayrı-ayrı fərdlərin nəfsi bu prinsiplərə etiraz edə bilər. Amma bu etiraz ağıl yox, nəfsə əsaslanır. Yeni şəriətdə ötən şəriətin prinsipləri təsdiqlənir və onun xırdalıqları zaman və məkan tələblərinə uyğun tənzimlənir. Məsələn, bütün şəriətlərdə namaz vacib sayılmışdır. Amma ayrı-ayrı dinlərdə namaz formaca fərqlənir. Belə bir şəriətin özündə də dəyişən hökmlər mövcuddur. Müsəlmanlar İslamın ilk illərində beytul-müqəddəsə üz tutub namaz qılırdılar. Peyğəmbərin (s) besətindən bir neçə il ötmüş uyğun hökm dəyişdi və müsəlmanlar üzü Kəbəyə namaz qılmalı oldu. Bəli, bir dində hökmlər dəyişdiyi kimi, ayrı-ayrı dinlərdə də uyğun dəyişikliklər baş verə bilər. Əlbəttə ki, dəyişikliklər yalnız cüzi məsələlərə aiddir.



---

۱- [۶۵] “Nisa”, ۱۶۰

۲- [۶۶] “Ali-İmran”, ۵۰

## Beşinci məclis

### İlahi buyuruqda Allahla rabitə, dünya istəyi və bəndələrə nəvaziş mövzusu

Ey Musa! Sən mənim bəndəmsən, mən də sənin məbudunam. Həqir, yoxsul, adamı alçaq sayma. Dünya malının azlığına görə varlıya həsəd aparma. Məni yada salanda təvazökar ol. Bəla və müsibətə düçar olanda rəhmətimə görə ümidvar ol, müti və ".qəmli səslə Tövratın şirinliyini mənə göstər

### Allahla rabitə və Ona bəndəliyə etiqadın təzahürü

Minacatın bu hissəsində Allah-təala həzrət Musaya xitabən altı öyüd bəyan edir. Birinci bənddə buyurulur: "Ey Musa! Sən mənim bəndəmsən, mən də sənin məbudun." Bu cümlə həzrət Musanın diqqətini insanın Allahla rabitəsinə yönəldir. Maraqlıdır ki, Allah-təala Tur dağında öz peyğəmbəri ilə minacatda Allah qarşısında bəndəlik məsələsini yada salır. Məgər həzrət Musa Allahın bəndəsi olduğunu bilmirdimi? Nə üçün Allah həzrət Musanın bəndəliyini, öz rübubiyyət məqamını yada salır? Amma dərindən düşündükdə görürük ki, nəzərdə tutulan insanın Allahla rabitəsinin qırılmazlığıdır və həyatımız bu rabitədən asılıdır. Bu nöqtəyə diqqət insanın bütün düşüncə və rəftarlarının əsası sayılır. Kamillik və bəndəlik yolunda addım atmaq istəyən kəs bütün varlığının Allahın mülkü olduğuna inanmalıdır. İnsan şübhə etməməlidir ki, onun bütün varlığı Allahın bütün mülküdür. İnsanın bəndəliyinə və Allahın rübubiyyətinə diqqət insanın öz məbudu ilə zati və həqiqi rabitəsindən danışır. Əfsus ki, insan bu mühüm .həqiqətdən qafildir

İnsanın Allahla rabitəsinə, bu rabitənin mənəvi və maddi həyatda roluna diqqət bizə anladır ki, bütün büdrəmələrimizin

illəti insanın bəndəlik və Allahın rübubiyyət məqamına diqqətsizliyimizdir. Kiçikli-böyüklü bütün günahlar, Allahla savaş və şirk məhz bu diqqətsizlikdən qaynaqlanır. İnsan günah iş görmək qərarına gəldiyi vaxt, məsələn naməhrəmə baxmaq istədikdə ixtiyarına verilmiş gözlərin Allahın mülkü olduğunu düşünsə uyğun addımdan çəkinər. Axı bu gözlərə nuru Allah vermiş və Allah onlara haraya baxmağı bildirmişdir. Öz səadətinin Allahdan asılı olduğuna inanan insan bilir ki, uyğun şəhvətli baxış onu ilahi rəhmətdən məhrum edər, cəhənnəmə sürükləyər. Məsələn, haram danışığa qulaq asmaq istəyən insan varlığına hakim olan Allahı yada saldıqda bir anlıq ləzzətə görə əbədi səadətdən məhrum olmaq istəmir. Əlbəttə ki, varlığının Allaha məxsus olduğunu .düşünən şəxs heç vaxt böyük ictimai günahlara, dində bidətlərə, şirkə yol vermir

Nəzərə alsaq ki, bütün günah və fəsadların əsas səbəbi Allahın yaddan çıxarılmasıdır, bütün həyatımız boyu Allahın bəndəsi olduğumuzu və işlərimizin Ondan asılı olduğunu unutmarıq. Bu diqqət nə qədər dərin və əhatəli olarsa insanın ilahi məqama yüksəliş məqamı da artar. Bu təkamül yolu ibtidai mərifət və bəndəlik məqamı ilə tanışlıqdan başlayıb, ali yəqin və məbudla rabitə məqamında başa çatır. İnsanın təkamülü üçün başqa bir yol yoxdur. İnsan Allaha və ilahi yolda hərəkətin bariz nümunəsi olan .bəndəliyə diqqət yetirməklə təkamül mərhələlərini ardıcıl şəkildə adlaya bilər

Həzrət Musa Tur dağında bir neçə gün ibadətə məşğul olduqdan sonra məbudu ilə minacat tövfiqi (yardımı) əldə edir. O qəlbən öz məbudunu dinləməyə başlayır. Allah-təalanın onun nəzərinə çatdırdığı ən əsas nöqtə budur ki, Musa bəndədir və Allah onun məbudu! Yəni insan üçün həyatı boyu gündəmdə duracaq ən mühüm məsələ onun Allaha bəndəlik məsələsidir. Amma bu gün qərb mədəniyyəti Allaha bəndəlik həqiqətinə dözümsüz yanaşır. Onlar insanların buxovundan çıxıb Həzrət Haqqa qul olmağı quldarlığın davamı hesab edirlər. Dinsiz ziyalılar deyir ki, İslam quldarlıq dövründə zühur etdiyindən

Allah Quranda insanı qul, Allahı ağa kimi tanıtdırmışdır. Onların nəzərincə, quldarlığa son qoyulmuş hazırkı dövrdə insan öz ağasıdır. Guya modernizm dövründə vicdan və vəzifə kimi zərurətlərə yer yoxdur. Bəli, modernizm insanı yalnız öz haqqı uğrunda mübarizəyə çağırır. Modernistlərin nəzərincə bu dövrün insanları əvvəlki dövrün insanlarından köklü şəkildə fərqlənir. Əgər keçmişdəki insanlar başqaları qarşısında məsuliyyət daşımışlarsa, bu günki insanlar yalnız özünə borcludur. Onlar bildirirlər ki, həzrət Musa qədim dövrdə yaşadığından Allah onu bəndə, özünü məbud kimi təqdim edir. Guya həmin əqidələrə qayıtmaq keçmişə qayıtmaqdır. Hansı ki, Quran və Peyğəmbər (s) sünnəsinə inananlar Allaha bəndəliyi əsil azadlıq sayır və öz səadətlərini məbudlarının əlində görürlər. Tövhid əhli inanır ki, Allahın iradəsi bütün .varlıq aləminə hakimdir və biz insanların Allahdan uzaqda heç bir qüdrəti yoxdur

## Tabeçilikdə olanlara ehtiram və bəndələrə nəvaziş

Allah-təalanın həzrət Musaya ikinci öyüdü yoxsullara ehtiram və onların alçaldılmamasıdır. Bu öyüdə həm şəxsi, həm də ictimai münasibətlərdə diqqətli olmaq lazımdır. İnsanlar yoxsulluğuna görə əskik sayılmamalı, məsullar beynəlmiləl rabitələrdə ehtiramla rəftar etməlidirlər. İslam rəhbərləri dünyanın azğın başçıları sayağı məhrum Afrika xalqları kimi yoxsul xalqları əskik saymamalıdır. Olsun ki, bu .millətlər Allahın nəzərində başqalarından daha əzizdir

Dünyapərəstlər var-dövləti ağalıq səbəbi sayır, sərvət sahiblərini əziz tutur, yoxsul insanlara yuxarıdan aşağı baxırlar. Amma ilahi məntiqdə var-dövlət üstünlük ölçüsü deyil. Əslində sərvət sınaq vasitəsidir və imtiyaz sayılmır. İnsanı başqalarından üstün .edən onun təqva və Allaha itaətidir

Allah üçün bütün bəndələr əzizdir, irq, məqam və var-dövlət imtiyaz sayılmır. Allah-təala onunla rabitəsini qoruyan yoxsul möminləri daha çox sevir. Belələrinə hörmət göstərənlər

də dünya və axirətdə Allahın razılığını qazanır. Sevgili Peyğəmbər (s) bu barədə buyurur: "Yoxsul müsəlmanı əziz tutub ona hörmət göstərən şəxs qiyamət günü (Allahla Allah ondan razı olan halda görüşər."(1)

Əksinə, Allahın bəndələri arasında ayrıseçkilik salan, yoxsul müsəlmanı məhz yoxsulluğuna görə sərvətlidən aşağı tutan insan Allahı qəzəbləndirir və özünü cəhənnəm oduna atır. İmam Riza (ə) salam verərkən varlı ilə yoxsul arasında fərq qoyan şəxs haqqında buyurur: "Yoxsul müsəlmanla görüşərkən onu varlıdan fərqləndirib salamlaşan şəxs qiyamət günü Allahla Onu qəzəbləndirmiş halda (görüşər."(2)

İmam Sadiq (ə) yoxsul möminə ehtiramla bağlı buyurur: "Yoxsul mömini alçatmayın. Həqiqətən, yoxsul mömini alçaldan və ya onu əskik sayan şəxsi bu işdən əl çəkib tövbə qılmasa, Allah alçaldıb düşmən tutar." Başqa bir məqamda həzrət buyurur: "Mömini yoxsulluğuna görə əskik bilən və ya onu təhqir edən kəsi Allah qiyamət günü xalq (qarşısında rüsvay edər."(3)

**Dünya malını puç sayıb ona görə həsrət çəkməmək**

Allah-təalanın həzrət Musaya üçüncü öyüdü bu idi ki, dünya və dünya nemətləri ona böyük görünməsin. Dünya malını böyük sayan insan adətən yoxsulları saya salmır, varlılara həsəd aparır. İnsan bilməlidir ki, dünya nemətləri nə qədər böyük görünsə də, Allahın nəzərində heçdir: "De ki, dünya matahı cüzi bir şeydir və axirət dünyası (təqvalılar üçün daha da üstündür."(4)

Əgər mömin qəbul etsə ki, hətta milyardlarla ölçülən dünya malı heçdir, var-dövlətə görə narahat olmaz, varlılara həsəd aparmaz. Bələlərini yalnız axirət nemətləri .düşündürür



---

Biharul-ənvar", c. ۷۲, bab ۹۴, rəvayət ۳۰, s. ۳۸" [۶۷] -۱

Həmin mənbə, h. ۳۱ [۶۸] -۲

Həmin mənbə, c. ۷۵, bab ۵۶, s. ۱۴۶, h. ۱۵ [۶۹] -۳

Onlar yalnız Allahın razılığını qazanan möminlərə qibtə edirlər. Bəli, dünya malını heç sayan insan nə varlılara qibtə edir, nə də yoxsulları əskik sayır. O başa düşür ki, .hamının yoxsul saydığı bir kəs Allahın nəzərində daha əziz ola bilər

Ayə və rəvayətlərdən belə görünür ki, başqalarının var-dövlətinə həsəd aparmamaq üçün dünya nemətlərinin hikmət əsasında əta olunduğuna inanmaq lazımdır. Birinə dünya malı verib, birini dünya malından məhrum etmək Allahın təqdiri və hikmətidir. İlahi hikmət tələb edir ki, bir zümrə varlı olsun, digər bir zümrə yoxsulluq içində yaşasın. Hamı Allahın istək və iradəsinə təslim olmalıdır. Varlılar qürrələnməməli, yoxsullar pərişan olmamalıdırlar. Çünki hər iki halda insanlar sınağa çəkilir. Sadəcə bu .sınaqlardan uğurla çıxmağa çalışmaq lazımdır

Bəzilərinə elə gəlir ki, Allah sevdiyi insana bol dünya neməti verir. Onların nəzərincə, əgər Allah birinə qəzəblənirsə, onu yoxsulluğa düçar edir. Amma Qurani-kərimdə bu barədə belə buyurulur: “Rəbbi insanı sınağa çəkib onu əzizləyəndə və nemət verəndə deyər ki, Rəbbim məni əziz tutdu. Elə ki, Rəbbi onu sınağa çəkib ruzisini əskildər, belə (deyər: “Rəbbim məni alçaltdı.”(١

Əslində isə həqiqi və əbədi nemət axirət nemətləridir. Yalnız axirət nemətləri Allahın sevgisini göstərir. Bu nemətlərdən məhrumluq Allahın qəzəb göstəricisidir. Dünya nemətləri isə sınaq vasitəsidir. Dünya nemətinə çatanlarla dünya nemətindən məhrum olanlar arasında möminlik baxımından heç bir fərq yoxdur. Hər iki zümrə .sınağa çəkilir. Var-dövlət sevgi, yoxsulluq qəzəb nişanəsi deyil

Var-dövlətin sevgi nişanəsi olmadığına inanmaq üçün tarixə nəzər salaq. Bir çox peyğəmbərlər yoxsulluq içində yaşamışlar. Onların həyatı şəhadətlə başa çatmışdır. Əksinə, bir çox kafirlər və Allah düşmənləri var-dövlət və asayiş içində yaşamış, dünya .nemətlərindən daha çox bəhrələnmişlər



---

Fəcr”, ١٥, ١۶“ [٧١] -١

Qarunu misal göstərmək olar. Allah-təala Qarunun var-dövləti haqqında buyurur: “Qarun Musanın dövründən idi. Onlara sitəm qıldı. Ona o qədər xəzinə verdik ki, yalnız açarları güclü bir dəstəyə ağır gəldi. Qövmü ona dedi: “Fərəhlənmə, Allah fərəhlənənləri sevməz.”(١)

Bəni-İsrailin dünyaya aldanmış bir qrupu Qarunun var-dövlətini görüb həsrət çəkirdilər. Onlar deyirdilər: “Ey kaş Qaruna veriləndən bizim də olaydı. Həqiqətən o, böyük bəhrəyə malikdir.”(٢)

Amma sonda hamı gördü ki, Qarunun saysız-hesabsız dövləti ona fayda vermədi. Qarun ilahi sınaqda uğursuzluğa düçar olub əzaba düşdü; özü də, sərvəti də məhv oldu.

### Sərvət istəyi və «istidrac» qanunu

Bir halda ki, həm var-dövlət həm də yoxsulluq sınaq vasitəsidir, sərvət sahibi olanlar vəzifəsinə əməl edib həmin sərvəti düzgün yolda xərcləməli, yoxsulluğa düşənlər səbr edib şikayətlənməməlidir. Yoxsul insan şəri hökmlərə riayət edib başqalarının sərvətinə göz dikməməklə yoxsulluq ağrısına çarə qılmalıdır. Bilməliyik ki, bəzən var-dövlət özü də bir cəza olur. Günaha batıb Allahla düşmənçiliyini artıran kəsə “istidrac” qanunu tətbiq olunur. Bu qanuna əsasən Allah yolunu azmış kəsin var-dövlətini artırır ki, o dünya ləzzətlərinə daha çox məşğul olsun və cəhənnəmə doğru daha sürətlə hərəkət etsin. Allah-təala Onun nemətlərindən sui-istifadə edib göstərişinə müxalif çıxanlar haqqında buyurur: “Onların var-dövləti və övladları səni təəccübləndirməsin. Allah bu yolla onlara dünya həyatında yalnız əzab vermək istəyir. Qoy kafir olduqları halda canları çıxsın.”(٣)



---

١- [٧٢] “Qəsəs”, ٧۶

٢- [٧٣] “Qəsəs”, ٧٩

٣- [٧۴] “Tövbə”, ٥٥

Allah-təala azğınlıq yolunu tutub istidrac qanununa tuş gələnlər haqqında, eləcə də hidayət yolunda xoşbəxtlik üçün daha çox çalışanlar barəsində buyurur: “Hər kəs ötəri dünyanı istəsə, tezliklə istədiyimizə dilədiyini verərik. Sonra cəhənnəmi ona məskən edərik. O məzəmmət olunmuş və zəlil halda oraya daxil olar. Hər kəs axirəti istəsə, onun yolunda çalışsa və mömin olsa, zəhmətini mükafatlandıracağıq. Bunlara və onlara Rəbbinin ətası ilə əl tutarıq. Rəbbinin ətası (kimsəyə) qadağa olunmayıb.”(١)

İstidrac qanununa məhkum olan kəs islah olmayan şagird və ya övlada bənzəyir. Müəllim, ya da ata onun islahından ümidini üzdükdən sonra özbaşına buraxır. Demək, Allah-təala həm doğru yolu tutana, həm də azğınlıq yolunu seçənə yardım göstərir. Hər kəs öz istək və iradəsi ilə nəzərdə tutduğu məqsədə çatır.

Allah-təala birinci qrup haqqında buyurur: “Doğru yola üz tutanları (Allah) mümküncə hidayət etdi, onlara təqva verdi.”(٢) İkinci qrup haqqında buyurulur: “(Haqdan) Dönən kimi Allah onların qəlblərini döndərdi.”(٣)

Allah-təala azğınlığa layiq olanların qəlbini döndərir. Həmin vaxtdan bütün hidayət yolları onun üzünə bağlanır, daha çox azğınlıq vasitəsi önə çıxır. Yol açılır ki, belə bir şəxs Allahın əbədi cəzasına daha sürətlə çatsın.

Deyilənlərə əsasən var-dövlət və yoxsulluq insan üçün sınaq vasitəsidir. Dünya nemətlərinə çatmış insan qürrələnməməlidir. Əksinə, sərvət əldə etdikdə diqqətli olmaq, bu sınaqdan uğurla çıxmaq lazımdır. Eləcə də sərvət və neməti əldən çıxarmış insan sınağa çəkildiyini unutmamalı, ümidsizliyə qapılmamalıdır. Belə bir məqamda məyus olmuş insan uğursuzluğa düçar olmuşdur: “Əlinizdən çıxan şeyə görə



---

١- [٧٥] “İsra”, ١٨-٢٠

٢- [٧٦] “Muhəmməd”, ١٧

٣- [٧٧] “Səff”, ٥

(qəmlənməyin, sizə verilənə görə sevinməyin. Allah fəxr edən xudpəsəndi sevmir."(١)

**Allahın mütilik zikri və onun rəhmətinə ümid**

Dördüncü nəsihətdə Allah-təala həzrət Musaya tövsiyə edir ki, Onu mütiliklə yad etsin. Şübhəsiz ki, Allah zikrinin mərtəbələri var. İnsanlar Allahı eyni dərəcədə diqqətlə zikr etmir. Bəziləri üçün zikr sadəcə dil hərəkətidir. Beləleri zikr gedişində səmimiyyət və diqqətdən məhrumdurlar. Əgər zikr riyadan uzaq olsa öz həddində dəyərlidir. Amma belə bir zikrin də insan ruhuna bir o qədər təsiri yoxdur. Yalnız mütiliklə müşayiət .olunan zikr həqiqi təkamülə səbəb olur, insanı rəzalətdən fəzilətə yüksəldir

Allah-təala beşinci öyüddə buyurur: "Bəla və müsibətə düçar olanda rəhmətimə görə ümidvar ol." Yəni rəhmətimə ümid edib bu bəlanın uzaqlaşacağını gözlə. Dünya həyatı çətinliklərsiz ötüşmür. Həyatda çətinlik çəkməyən insan yoxdur. Allah-təala bu barədə (buyurur: "Həqiqətən, insanı məşəqqətdə yaratdıq."(٢)

İnsanlar qarşılaşdıqları problemlərə müxtəlif cür reaksiya verirlər. Bəziləri tamamilə ümidini üzüb Allahı yaddan çıxarır. Onlar pərişanlığa düçar olub qurtulmaq üçün hətta cəhd göstərmirlər. Allah-təala çətinliklər qarşısında ümidini itirən, bütün işlərin Allahın əlində olduğunu unudan insanlar haqqında buyurur: "İnsana nemət verdikdə üz (döndərib uzaqlaşır, ona pislik üz verdikdə ümidini itirir."(٣)

İnsan hətta kiçik çətinliklərlə üzləşdiyi vaxt dərhal Allahın sorağınca getməyə hazırlaşmalıdır. Adi baş ağrısına görə də Allahdan şəfa istəmək lazımdır. Aclıq üz .verdikdə insan öncə Allahdan nemət istəməli, sonra vasitələr ardınca getməlidir



---

Hədid", ٢٣" [٧٨] -١

Bələd", ٤" [٧٩] -٢

İsra", ٨٣" [٨٠] -٣

İstənilən bir halda Allahı unutmaq olmaz. Əgər insan heç vaxt Allahı unutmasa və onun rəhmətindən ümidini üzməsə, heç bir çətinlik onu narahat etməz. O istənilən bir ehtiyacının təmini üçün Allaha əl açar. Axı Allah özü buyurub ki, ehtiyac duyulan vaxt (Ondan yardım istənilsin: “Allahın fəzlindən diləyin, Allah hər şeyi biləndir.”(١

Allah-təala həzrət Musaya altıncı öyüdündə buyurur: “Müti və qəmli səslə Tövratın şirinliyini mənə göstər.” Bu gün həqiqi Tövrat əlimizdə deyil. Amma həmin Tövratdan da üstün olan Quran ixtiyarımızdadır. Quranı mütiliklə və həzin səslə oxuyaq. Çalışaq ki, Quran qəlbimizə və ruhumuza hopsun. Quran qiraət edərkən Allahla danışdığımızı hiss edək. Əgər belə bir mərifət dərəcəsinə çatsaq, Allah kəlamını həzin, qəmli səslə, mütiliklə oxusaq, Allah bizim səsimizdən razı qalar və lütfünə çatarıq.



---

١- [٨١] “Nisa”, ٣٢

### Altıncı məclis

### Zikrin bəhrəsi

Bu qüdsi hədisin araşdırdığımız bəzi bəndlərində həzrət Musaya xitabən Allaha diqqət və Allah zikrini, bu işdə xüzu və xüşunu gözləməyin zəruriliyi bildirilir. Digər bir bənddə zikr zamanı Allaha etimad zəruri sayılır. Bildirilir ki, zikr zamanı Allaha etimad :göstərmək lazımdır

Zikr zamanı mənə etimadın olsun, mənə etimadı olan insanın diqqətini mənim zikrimə“ ”.yönəlt

Şübhəsiz ki, müvəhhid (təkallahçı) və mömin insan üçün Allahın zikri çox dəyərlidir. Zikr ibadətlərin səbəbi kimi təqdim olunur. Allah-təala həzrət Musanın besətinin başlanğıcında tövhid məsələsini bəyan etdikdən sonra mühüm etiqadi prinsip kimi öz zikrindən danışır, bildirir ki, zikr insan səadətinin əsası, ibadətin hədəfidir. Buyurulur ki, Allahdır yeganə məbud, Ondan savayı məbud yoxdur, Ona pərəstiş etmək və onun (zikri olaraq namaz qılmaq lazımdır.(١

### Rəftarın iman və etiqadla əlaqəsi

Allah zikrinin əhəmiyyətini bilmək üçün onun insan səadəti ilə əlaqəsini nəzərdən keçirmək lazımdır. Nəticədə məlum olur ki, Allah zikri imanlı rəftarı gücləndirir, insan xoşbəxtliyini təmin edir. Həyatdakı bir çox qərarlar və rəftarlar istər-istəməz insanın etiqadlarından qaynaqlanır. Hətta öncədən etiqadını yada salmamış şəxs addım atdıqda uyğun etiqaddan təsirlənir. İlahi etiqadlar mömin insanın rəftarlarının mənbəyidir. Necə ki, materialist bir insanın rəftarları onun uyğun etiqadından nəşət tapır. Qərara gəlməzdən, addım atmazdan qabaq insan öz etiqadını yada salmasa da, onun səh:۶۰

---

Bax: “Taha”, ۱۴ [۸۲] -۱

etiqadı təsirlidir. Mömin insanla dinsiz insanın əməlləri zahirən eyni görünə bilər. Amma uyğun əməllərin mahiyyətinə varsaq ciddi fərqlərlə rastlaşarıq. Dinsiz insan addım atarkən yalnız dünya ləzzətlərini, mömin insan addım atarkən həm də axirəti nəzərdə saxlayır. Mömin və dinsiz tələbə hər ikisi təhsildə çalışır, amma yalnız mömin .tələbənin təlaşları dəyərlidir. Çünki bu tələbə ali məqsəd uğrunda səy göstərir

Deyilənlərdən aydın olur ki, iman və mərifətə diqqət yetirilməsinin mühüm bir səbəbi onların insanın rəftarlarına təsiridir. Bəli, bizim rəftarlarımız iman və mərifətimizdən asılıdır. Bu səbəbdən də Allah-təala bəzi ayələrdə saleh əməli imanla yanaşı zikr etmişdir. Bu yolla nəzərə çatdırılır ki, əməlin dəyəri Allaha imandan asılıdır və saleh əməl Allaha imandan qaynaqlanır. Bu ayələrdən üçünü nəzərdən keçirək: "İman gətirib saleh işlər görənlər behişt əhlidir və orada əbədi qalacaqlar."(١) "İstər kişi, istər qadın saleh iş görüb mömin olsa, hökmən ona pak bir həyat verərik. Onları gördükləri yaxşı işlərə görə mükafatlandırarıq."(٢) "Axirəti istəyib son həddə çalışan və mömin (olan hər kəs təlaşı dəyərləndirilənlərdəndir."(٣

Bəli, saleh əməl imandan qaynaqlanır. Əməllə iman arasında qarşılıqlı rabitə var. Bu əsasla imandan qaynaqlanan əməl imanı gücləndirir, dinsizlikdən qaynaqlanan əməl .dinsizliyi qüvvətləndirir

**İmanla elm və mərifət arasında əlaqə**

Saleh əməl imandan qaynaqlandığı kimi, iman da öz növbəsində elm və mərifətdən nəşət tapır. Bəli, saleh əməl iman mərtəbəsi ilə əlaqəlidir. İnsanın mərifəti, elm və tanışlığı müəyyən bir baxımdan iki növə bölünür: Qazanılan (hüsuli) və



---

Bəqərə", ٨٢" [٨٣]-١

Nəhl", ٩٧" [٨۴]-٢

İsra", ١٩" [٨۵]-٣

dərk olunan (hüzuri). Hüsuli mərifət vasitəli mərifətdir və düşüncə yolu ilə əldə olunur. Məsələn, bizdən Allah və tövhid haqqında soruşularkən düşüncəmizdə olanı dilə gətiririk. Bu mərifətin dərəcələri var. Onun ən aşağı dərəcəsi də insanın əməl və rəftarlarına təsir göstərir. Uyğun mərifət gücləndikcə onun əmələ təsiri də güclənir. Amma hüzuri elm vasitəsiz elmdir. Belə bir mərifətə malik olan insan həqiqəti dərk edir. Bu mərifətdə xəta yoxdur. Əmirəl-mömininindən (ə) "Rəbbini görmüsənmi" soruşularkən həzrət buyurur: "Görmədiyim Allaha necə ibadət edim?!" Ondan bu müşahidənin necəliyi haqqında soruşularkən həzrət buyurur: "Gözlər onu aşkar (görməz, amma qəlblər düzgün iman həqiqətləri ilə onu dərk edər."(١)

### Zikr və onun rəftara təsiri

Müəyyən bir həqiqətdən xəbərdar olduğumuz vaxt həmin xəbərdarlığa diqqətli olduqda onun təsirlərindən faydalanırıq. Bəli, nəzərdə saxlanılan mərifət rəftarlara təsir göstərir. Diqqət elmdən fərqli bir həqiqətdir. Bəzən insanın elmi olur, amma diqqəti olmur. Məfhumundan xəbərdar olduğumuz bir həqiqətin nümunələrinə diqqətsiz qalmağımız da mümkündür. Həqiqəti təsirli edən onun nümunələrinə diqqətdir. Diqqət nə qədər əhatəli olarsa, onun təsiri də güclü olar. Namaz və orucdan başlamış bütün ictimai-siyasi fəaliyyətlərimiz Allaha diqqətdən təsirlənir. İman və .diqqətimiz nə qədər güclü olarsa, onların əməldə təsiri də güclü olar

Bilirik ki, iman əməlin ruhudur. Amma bunu bilmək bəs etmir. Bunu əməl məqamında unutmamaq lazımdır. Yalnız əməldə özünü göstərən iman və diqqət dəyərlidir. Əgər Allah-təala Allaha etimad məsələsini həzrət Musaya bəyan edirsə, bu o demək deyil ki, Musa bu həqiqətdən xəbərsizdir. Şübhəsiz ki, həzrət Musa deyilənlərə etiqadlı bir insandır. Bizim etiqadımıza



---

Nəhcül-bəlağə", xütbə ۱۷۹" [۸۶] -۱

görə, ilahi peyğəmbərlər peyğəmbərliyə seçilməzdən əvvəl də məsum və təkallahçı olmuşlar. Allahın bu nöqtələri bəyan etməkdə məqsədi budur ki, həzrət Musanın və mömin bəndələrin iman və diqqəti fəallaşsın. Yalnız fəal iman və diqqət əmələ təsir göstərir. Belə bir diqqətin sayəsində insanın mərifəti daha da kamilləşir, onun həyatının bütün sahələrinə yetərli təsir göstərir. Bəli, həqiqi zikr və diqqət Allahın hüzurunun dərki ilə şərtlənir. Bu diqqət gücləndikcə insanın əməl və rəftarlarına daha .çox təsir göstərir

Allah hüzurunun dərki və Ona qəlbən diqqət dil zikrindən uca bir məfhumdur. Namaz və digər ibadətlərdə ardıcıl zikr ona görə tez-tez vurğulanır ki, insan qəlb zikri vasitəsi ilə Allahın hüzurunu dərk edir. Belə bir zikr mərifəti fəallaşdırır, insanı qəflətdən qurtarır. İlahi mərifət fəallaşdıqca məbuda diqqət artır, əməl daha çox təsirə məruz qalır. Qəlbən diqqətlə müşayiət olunmayan dil zikri zikrin ən aşağı mərtəbəsidir və rəftarlara bir o qədər də təsirli deyil. Əmələ təsirli zikr qəlb zikridir və onun da öz mərhələləri var. Onun ən ali mərtəbəsi Allaha kamil diqqət və insanın bu diqqətdə qərq olmasıdır. Məbuda diqqətdə qərq olan insan hətta özünü unudur, məbuddan savayı .hər nəyi yaddan çıxarır

### Zikr və Allaha etimadın mərtəbələri

Allah-təalanın həzrət Musanın nəzərinə çatdırdığı kimi, zikrin uca mərtəbəsinə çatmaq üçün bu işdə müti olmaq lazımdır. İnsan Allah hüzurunda nə qədər kiçilərsə, bir o qədər də zikrin uca mərtəbəsinə nail olar. Belə bir zikr insanda aramlıq və arxayınlıq yaradır. Uyğun zikr haqqında Allah-təala buyurur: “O kəslər ki, iman gətirmişlər və qəlbləri Allah zikri ilə aramlıq tapır. Bil ki, qəlblər Allah zikri ilə aram olur.”(۱) “Bil ki, Allahın zikri ilə qəlblər aramlıq tapar” cümləsində “Allahın zikri” təbirinin “aramlıq tapar” təbirindən öncə



---

۱- [۸۷] “Rə’d”, ۲۸

gəlməsi zikrin əhəmiyyətini önə çəkir. Belə bir ardıcıllıqda ilahi zikr daha çox vurğulanır və onun əhəmiyyəti nəzərə çatdırılır. Başqa sözlə, qəlbin aramlığı ilahi zikrdən qaynaqlanan haldır. Amma başqa cümlələrdə öncə arxayınlığın, sonra Allah zikrinin qeyd olunduğu ilə rastlaşırıq. Bir cümlədə zikrin, digər bir cümlədə arxayınlığın vurğulanması göstərir ki, zikr və arxayınlığın mərtəbələri var. Zikri başlayıb qəlbən diqqətli olmağa çalışan insan zikrin daha uca mərtəbəsinə nail olur. Belələri davamlı zikr vasitəsi ilə zikrin ali mərtəbəsinə çatır, aramlıq və arxayınlıq əldə edirlər. Belə bir zikri Əmirəl-möminin (ə) şəbaniyyə minacatında yada salır: "Pərvərdigara! Mənə öz ".zikrində heyranlığı ilham buyur

Uyğun iki cümlədə aramlıq və arxayınlığın iki dərəcəsinə işarə olunur. Birinci dərəcə ilə qüdsi hədisdə Allah-təalanın həzrət Musaya nəsihətində rastlaşırıq. Burada söhbət diqqətli zikrdən qaynaqlanan aramlıq və arxayınlıqdan gedir. Bu zikrin aşağı mərtəbəsidir. Amma yada saldığımız ayədə zikrin ali mərtəbəsinə işarə olunur. Bu ayədə nəzərdə tutulmuş aramlıq və arxayınlıq Allahın tövfiqi ilə özünütərbiyədən sonra əldə olunur. İnsana belə bir aramlıq lütf olunduqda onun bütün iztirablarına son qoyulur. Allah zikrinə məşğul aşiq bəndənin qəlbində məbuddan qeyrisinə diqqətə yer .qalmır. Əslində belə bir diqqət və iztirabın kökü ilahi mərifətin çatışmazlığındadır

## Dünyapərəstlərin və Allah düşmənlərinin doğru yoldan imtinası

Allah-təala həzrət Musaya tövsiyə edir ki, Allaha diqqətlə aramlıq tapanları Onun zikrinə çağırsın. Deyilənlərdən aydın olur ki, insan öz ətrafında doğru yola gəlişi üçün zəmini olanları, Allahı yada sala biləcək fərdləri Ona doğru dəvət etməlidir. Allahla düşmənçilik edən, Allahın qoyduğu hədləri məsxərəyə qoyan insanları Allaha doğru çağırmağa dəyməz. Onlar nəinki Allahı zikr etmir, hətta bu işdən ikrah duyurlar. Belələri Allahın qoyduğu hədləri dünya ilə bağlı arzuları üçün 

maneə sayırlar. Allah-təala onlar haqqında buyurur: “Allah birliyi ilə xatırlandığı vaxt axirətə inanmayanların qəlbləri sıxılır. Elə ki Allahdan qeyrisi yada salındı, onlar (qəfildən sevinirlər.”(١

Allah-təala həzrət Musaya tövsiyə edir ki, vaxtını doğru yola gəlişi üçün zəmini olan insanlara sərf etsin. Yalnız belələrinə Allahı xatırlatmaq və belələrinin qəlbinə Allah zikri ilə aramlıq vermək olar. Yalnız dünya ləzzətləri haqqında düşünən, mənəvi inkişafı üçün zəmini olmayan insanlara vaxt sərf edilməməlidir. Belələrinə Allahı xatırlatmağın faydası yoxdur. Çünki küfr və şirk onların vücudunu başdan-başa əhatəyə almışdır. Allah zikri onların yalnız düşmənçiliyini artırır. Deməк, Musa bütün diqqətini dünya və onun ləzzətinə yönəldənlərə arxa çevirməlidir. Necə ki, Allah-təala öz Peyğəmbərinə (s) buyurur: “Zikrimizdən üz çevirən, bu dünya həyatından savayı bir şey istəməyən (hər kəsdən üz döndər.”(٢

**İnsan dəyərinin ölçü meyarı**

Yaxşı baxsaq görərik ki, vücudumuzun dəyəri sevdiyimiz şeyin dəyəri həddindədir. Məsələn, gözəl bir avtomobil almaq fikrinə düşmüş insan daim hansı yolla pul əldə etmək fikrinə düşür. Belə bir insanın qəlbi növbənöv maşınların girib çıxdığı qaraj kimidir. Maşın olmayan qədim vaxtlarda daim yaxşı at haqqında düşünən insanın !qəlbini tövlə adlandırırdılar

Bəli, dünya cazibələrinə bağlanan, dünyəvi xülyalar qəlbini bürümüş insan axirəti yada salmır, Allahın öz bəndəsi üçün nəzərdə tutduğu uca məqamdan qəflətdə qalır. Beləleri yalnız ot və su haqqında düşünən canlıya bənzəyir. Amma ilahi tövfiqlə zehnini puç maddi düşüncələrdən təmizləyən şəxs ali insanlıq məqamına can atır və bu yolda səy və təlaşını əsirgəmir. Belə bir insanın varlığı çox dəyərli olur. Hədisdə səh:۶۵

---

Zumər”, ۴۵“ [۸۸] -۱

Nəcm”, ۲۹“ [۸۹] -۲

buyurulur ki, mömininin qəlbi Rəhmanın ərşidir.(١) Görəsən belə bir istedad əta olunmuş və qəlbi Allahın ərşi ola biləsi insanın heyvan səviyyəsinə enməsi ona layiqdirmi?!

Aydın oldu ki, insanın dəyəri onun qəlbən bağlandığı şeylər dəyərindədir. Düşüncəyə uyğun şəxsiyyətlər adi insanlara gizli qalsa da, həqiqətlərin mahiyyətinə varmış Allah övliyaları qarşı tərəfin şəxsiyyətini olduğu kimi dərk edir, onların düşüncəsini oxuyur. Mərhum molla Fəthəli Sultanabadi mərhum Mirza Şirazinin dövründə onun nümayəndəsi olaraq Samirrada imam təyin olunmuşdu. O təfsir və əxlaq dərsləri də tədris edirdi. Böyük alimlərdən biri nəql edir ki, bir gün mərhum Sultanabadinin camaat namazında iştirak edərkən yanımda bir kəniz dayanmışdı. Bu şəxs namazın ortasında iqtidadan çəkinib tənha namaz qılmağa başladı. Namazı başa çatdırdıqdan sonra yavaşca dedi: "Bu axund da şirə ardınca getdi!" Namazdan sonra mərhum Sultanabadinin yanına gedib əhvalatı danışdım. Mərhum Sultanabadi göstəriş verdi ki, həmin adamı tapıb gətirim. Amma nə qədər axtardımsa da onu tapa bilmədim. Yenidən mərhum Sultanabadinin yanına qayıtdım. O dizinə vurub ağlayaraq dedi: "Həmin adam doğru deyib. Mən cümə axşamları qonaq qəbul edirəm. Bu gecə də qonağım olmalıdır. Evdə qonaq üçün kətə hazırlayacaqdılar. Düşündüm ki, xuruşsuz kətə yaxşı olmaz, gərək bir qədər şirə alım. Namazın ortasında bu barədə düşünürdüm. Həmin müsafir zehnimdən ötəni oxuyub!"

Maddiyyata diqqət insanın dəyərini azaldır. İlk addımda Allah zikrinə məşğul olmaq lazımdır. İkinci addımda bu zikri dərinləşdirmək zəruridir. Uyğun hal zəif dalğa kimi ötüb keçməməlidir. İnsan qəlbən Allahla rabitəyə girdikdə onun qəlbi Allahın ərşinə çevrilir. Belə bir hal əldə edən insan onu qorumağa çalışmalıdır. Müxtəlif təxəyyüllər və vəsvəsələr qəlbə yol tapdıqda Həmin sərmayəni puça çıxarır. İnsan bilməlidir ki, nail olduğu zikr məqamı onun əbədi səadəti üçün



---

١- [٩٠] Bax: "Biharul-ənvar", c. ۵٨, bab ۴, s. ٣٩, h. ۶١

.əsas şərtdir. Bu hal problemlər qarşısında qəlbin aramlığını qoruyur

Bəli, Allah zikri insana şəxsiyyət bəxş edir. Belə bir insan təhlükələrlə üzləşdikdə narahatçılıq keçirmir. Çünki o özünü sonsuz qüdrət sahibi olan Allahın himayəsində görür. Anasını itirmiş körpə onu tapan kimi ağuşuna sığınıb rahatlaşır. Problemlər dəryasında özünü itirmiş insan da Allaha sığınıb həqiqi zikrə məşğul olduqda itkisini tapdığını hiss edib misilsiz aramlıq duyur. Əmirəl-möminin (ə) bu barədə buyurur: (“Özünü itirib bu itkini gəzməyən, amma itki sorağında olan kəsə təəccüb edirəm!”(١



---

”Ğurərul-hikəm“ [۹۱] -١

## Yeddinci məclis

### Bəndəliyin və tövhid etiqadının rəftarda təzahürü

Mənə pərəstiş et, başqasını mənə şərik qoşma və razılığımı qazanmaq qərarına gəl.“ Mən həmin uca mərtəbəli ağayam ki, səni ram torpaq, qarışıq gildən götürülmüş həqir sudan olan nütfədən çıxardım. Ondan sonra sən insan oldun və mən o nütfədən bir canlı mövcud yaratdım. Uca və mübarəkdir mənim zatım. Mənim yaratdığımda nöqsan ”.yoxdur və mən misilsizəm. Mən ölməz və daimi, yenilməzəm

### Tövhid və pərəstişə dəvət peyğəmbərlərin ilkin çağırışıdır

Tövhidə və pərəstişə dəvət, Allahın misilsiz zatına şərik qoşmamaq bütün ilahi peyğəmbərlərin ilkin çağırışı olmuşdur. Quranda oxuyuruq: “Hər vaxt hər ümmət arasında bir peyğəmbər seçdik. Allaha pərəstiş edin, tağutdan (uydurma (məbudlardan) uzaq olun.”(۱)

Allah-təala öz məhbubu ilə xəlvəti söhbətdə tövhidi yada salmaqla onu özünə pərəstişə, şərik qoşmamağa, razılığını əldə etməyə çağırır. Həzrət Musaya bir nemət olaraq buyurur ki, səni dəyərsiz nütfə və torpaqdan yaratdım, mənim tədbir və tərbiyəmlə inkişaf etdin və hazırkı mərtəbəyə çatdın. Uyğun dəvətə oxşar çağırışı .həzrət Musanın peyğəmbərliyinin başlanğıcında müşahidə etmək olar

Həzrət Musa həyatını təhlükədə gördüyü vaxt Misirdən qaçıb Mədyən şəhərinə üz tutdu. Orada bir ağac altında istirahət etdiyi vaxt quyu başına yığışıb su çəkmək istəyən adamlar gördü. İki qız kənarda dayanıb kişilərin quyudan uzaqlaşacağını gözləyirdi. Həzrət Musa onlara dedi: “Nə üçün burada



---

۱- [۹۲] “Nəhl”, ۳۶“

dayanmısınız?” Dedilər: “Atamız qoca və xəstədir, buraya su üçün gəlmişik. Gözləyirik ki, kişilər uzaqlaşsın, quyudan su götürək.” Həzrət Musa onların qabını alıb su ilə doldurdu, qoyunlarına su verdi. Sonra geri qayıdıb ağacın altında oturdu və dedi: “Pərvərdigara, mən sənin göndərdiyin xeyirə möhtacam.” Rəvayətdə nəql olunur ki, .həzrət Musa həmin dua üçün əl açdığı vaxt yarı xurmaya ehtiyaclı idi

Qızlar ataları Şüeybin yanına qayıtdılar. Şüeyb soruşdu: “Nə tez qayıtdınız?” Qızlar dedilər: “Saleh və mehriban bir şəxs bizim üçün quyudan su çəkdi.” Şüeyb qızlarından birinə dedi: “Get onu yanıma gətir.” Qız həzrət Musanın yanına gəlib həya ilə dedi: “Atam sizi mükafatlandırmaq üçün yanına çağırır.” Musa ona dedi: “Yolu mənə göstər ”.və arxamca gəl. Biz Yaqub övladları arxadan qadınlara baxmırıq

Həzrət Musa Şüeybin yanına gəlib öz əhvalatını ona nəql etdi. Şüeyb dedi: “Qorxma, sitəmkarların əlindən qurtulmusan.” Qızlardan biri dedi: “O güclü və düz adamdır. Onu işə götür.” Şüeyb həzrət Musaya dedi: “Səkkiz il muzdla mənə işləməyini istəyirəm. Əvəzində qızlarımdan birini sənə ərə verərəm.” Həzrət Musa razılaşıb səkkiz il Şüeybin yanında qaldı və onun qızı ilə evləndi. Sonra qərara gəldi ki, Misirə getsin. Mədyəndən Misirə qayıdan vaxt Tuba vadisində, Sina səhrasında qaranlıq və soyuq gecədə yolu itirdi. Qəfildən uzaqdan od göründü. Musa zövcəsinə dedi: “Burada məni gözlə, od olan yerə gedim. Yolu tanıyıb bir qədər od gətirim.” Musa oda çatdığı vaxt yaşıl və xürrəm bir ağac gördü. Ağac başdan ayağa od tutmuşdu. Musa ağaca yaxınlaşmaq istədikdə ağac uzaqlaşdı. Həzrət Musa qorxub geri döndü. Amma od ona yaxınlaşırdı. İlk ilahi vəhy məqamı çatmışdı. Od arasında Musanın qulağına belə bir səda gəldi: “Həqiqətən mənəm bir olan Allah. Məndən savayı məbud yoxdur. Mənə pərəstiş et, məni yada (salmaq üçün namaz qıl.”(١



---

”Taha”, ١۴; “Həyatul-qulub“ [٩٣] -١

İnsanın ən mühüm vəzifəsi ibadət və pərəstişdir. Allaha pərəstiş bəndə ilə Allahın ən ali rabitəsini göstərir. Pərəstiş vasitəsi ilə səadət qapıları insanın üzünə açılır. Quranın ondan çox ayəsində peyğəmbərlər öz risalətinə ibadətə çağırışla başlayır. Allah-təala həzrət Nuh haqqında buyurur: "Həqiqətən Nuhu qövmünə doğru göndərdik. O dedi: "Ey qövm! Allaha pərəstiş edin, sizin üçün Ondan savayı məbud yoxdur..."(١)

Qurani-kərimdə həzrət İsa haqqında buyurulur ki, o Allaha bəndəlik və pərəstişi yeganə düzgün və xoşbəxtlik yolu sayaraq qövmünə belə müraciət etmişdir: "Həqiqətən, Allah mənim və sizin Rəbbinizdir. Ona pərəstiş edin, doğru yol budur."(٢)

Digər bir ayədə Allah-təala bəndələrin Allahla əhd-peymanından danışır. Şeytanın bəndəlikdən boyun qaçırması yada salınır, itaətsizlik göstərənlər şeytanın ardıcılları kimi tanıtdırlır: "Ey Adəm övladarı! Məgər sizinlə əhd-peyman bağlamamışdımmı ki, şeytana pərəstiş etməyin, o sizin aşkar düşməninizdir və mənə pərəstiş etməyiniz doğru yoldur?!"(٣)

Allah-təala bəndəlik və pərəstişi təkcə insanların yox, həm də cinlərin vəzifəsi sayır. Bu iki varlığın yaranışında məqsəd onların Allaha ibadət etməsi olmuşdur: "Biz cinləri və insanları yalnız ibadət üçün yaratdıq."(٤)

### Allahın xüsusi rəhmətindən faydalanmaq üçün pərəstiş lazımdır

Qeyd etdiyimiz, eləcə də son ayə dini kitablarda və moizə məclislərində yetərincə araşdırılsa da, çoxları onların dərinliyinə varmır. Düşünmüşükmü ki, yaranışdan bu günədək bütün cinlərin və yer üzündəki milyardlarla insanın yaranış məqsədi nə üçün Allaha pərəstiş və bəndəlikdir? Allah bizim



---

١- [٩٤] "Ə'raf", ٥٩

٢- [٩٥] "Ali-İmran", ٥١

٣- [٩٦] "Yasin", ٦١

٤- [٩٧] "Zariyat", ٥٦

ibadətimizə ehtiyaclıdırmı? Nə üçün yalnız Ona pərəstiş etməyimizi istəyir? Əgər ?Allaha pərəstiş etməsək nə olar

Bu sualları cavablandırmaq üçün qeyd etməliyik ki, mərhəmət Allah-təalanın rəhmaniyyət və feyz sifətlərinin tələbidir. Bütün yaranmışlar, o cümlədən insan ilahi mərhəmət cilvəsidir. Bütün nemətlər və ətalar bu mərhəmətdən qaynaqlanır. Hər nə varsa Allahın feyz və rəhmətinin təzahürüdür. Amma bəzi mərhəmət cilvələri şəraitdən, tutumdan və istedaddan asılıdır. Uyğun mərhəmətlərə çatmaq üçün insan hazırlığa malik olmalıdır. Əgər insan hansısa ilahi rəhmətdən məhrum qalmışsa, bunun səbəbkarı onun öz əməl və rəftarlarıdır. Allah kimsəyə nəyisə əsirgəmir. Məhrum qalan insan sadəcə uyğun nemətlərdən bəhrələnmək üçün tutum və istedada malik deyil. İbadət və pərəstiş, bu işlərin müqabilində nəzərdə tutulmuş məqamlar Allahın ən üstün rəhmət cilvələrindəndir. Əgər Allah ibadət və pərəstişi heyvanlar üçün vəzifə saymamışsa, səbəb budur ki, yalnız insanlarda və cinlərdə Allaha bəndəlik yolunu .getmək istedadı var

Allahın xüsusi rəhmətinə çatmaq üçün insanla Allah arasında rabitəyə, bəndəlik və ibadətə ehtiyac var. İnsan öz ibadət və bəndəliyi ilə varlıq aləminin təkvini (fitri, təbii) bəndəlik qanununa əməl etmiş olur. Bu qanuna əməl edən insanda sonsuz mərhəmət əldə etmək istedadı yaranır. Sonsuz axirət aləmində bu ətalar gerçəkləşir. Əksinə, fitri bəndəlik şərtlərinə əməl etməyən və pərəstişdən boyun qaçıran insan əbədi əzaba düçar olur. Allah ağadır, biz isə onun bəndəsi. Bizə seçim imkanı verilib. Allah insanı ibadət və pərəstiş vasitəsi ilə bəndəlik şərtlərini yerinə yetirmək üçün yaradıb. Bu yolla özümüzdə sonsuz mərhəmətdən bəhrələnmə qabiliyyəti yaratmalıyıq. Aydın olur ki, nə üçün peyğəmbərlər öz dəvətlərinə bəndəliyə çağırışla başlamışlar. Bəli, Allaha pərəstiş yaranış məqsədidir. İbadət və bəndəlik Allaha yaxınlaşmaq üçün aydın və düzgün .yoldur

## Bəndəlik məqamına etiqadın insanın rəftarlarında təzahürü

Allaha bəndəlikdən xeyli danışılsa da, məclislərdə Allahın rübubiyyəti ilə bağlı ayə və rəvayətlər zikr edilsə də, Allahın rübubiyyətinə və insanın bəndəlik məqamına inanmayanlar çoxdur. Onlar nə üçün yarandıqları, hansı məqsədlə yaşadıqları və hansı məsuliyyət daşıdıqları barədə düşünmürlər. Onlar eynən başqa canlılar kimi yalnız qarınlarını doyurmağa və rahatlığa çalışırlar. Beləlləri öz ehtiyaclarını təmin etmək .üçün halal-haram bilmir, istənilən bir yolla var-dövlət əldə etməyə çalışırlar

Allah-təala insanlara bəndəlik məqamını anlatmaq, hər nəyin Allah mülkü olduğunu onların nəzərinə çatdırmaq üçün həzrət Musaya buyurur: "Mən həmin uca mərtəbəli ağayam ki, səni ram (olmuş) torpaq qarışıq gildən götürülmüş həqir sudan olan nütfədən çıxardım." İnsanın nəzərinə çatdırılır ki, o artıq gözəlliklərə, meyllərə və istedadlara malik bir varlıqdır. Nə varsa Allahdandır və insan Allahın mülküdür. Bəli, !heç nəyi olmayan insan öz malikinə, xaliqinə, Rəbbinə ibadət və bəndəlik etməlidir

Bəndəlik məqamına inam və bu məqamın dərki insanın həyatında böyük dəyişikliklər yaradır. Belə olduqda insan öz işlərini Allaha tapşırır, bütün işləri ibadət və bəndəlik məqsədi ilə yerinə yetirir. Onun yemək yeməkdə məqsədi ibadət üçün enerji əldə etmək olur. O ilahi vəzifələrini daha yaxşı icra etmək üçün istirahət edir, hətta ibadət zəmini hazırlamaq üçün işləyib pul qazanır. Onun ailə-övladın ehtiyaclarını ödəməyə səy göstərməsi də ibadət məqsədlidir. Allah da belə bir insanın bütün işlərini ibadət ünvanında qəbul edir. Bu işlərin əvəzində insana layiqincə mükafat verilir. Allahın rəsulu (s) buyurur: "İbadət on qisimdir və onun doqquz qismi halal ruzi (qazanmaqdır."(١



---

Biharul-ənvar", c. ١٠٣, bab ١, s. ١٨, h. ٨١" [٩٨] -١

Allahın razılığı, ilahi təklif olaraq görülən işlər ilahi təklif dairəsinə daxildir. Allahın göstərişi əsasında ailə-övladın ehtiyaclarını təmin etmək üçün göstərilən səylər də ibadətdir. İlahi təklif olaraq yerinə yetirilən izdivac da ibadət sayılır. Cihad üçün cəbhəyə gedən, təhsil alan, hətta xörək yeyən insanın məqsədi Allaha yaxınlaşmaqdırsa, bütün bu işlər ibadət sayılır. Amma nəfs istəkləri əsasında görülən .işlər şeytana bəndəlikdir və bu işlərin sonu cəhənnəmdir

**İxlas və ilahi niyyət ibadəti möhkəmləndirir**

Bəziləri zahirdə ibadət edib din libasında dindən dəm vursalar da, Allaha yaxınlaşmaq məqsədində olmadıqlarından şeytana bəndə sayılırlar. Onların əksər işləri nüfuz və məqam əldə etmək üçündür. Buna görə də bütün işlərdə, o cümlədən ibadətlərdə məqsədimizə diqqətli olmalıyıq. Görəsən atdığımız addım Allaha xatirdir, yoxsa nəfs istəyindən qaynaqlanır? Görəsən bizi addım atmağa vadar edən başqalarına xoş ?görünmək istəyi deyil

Biz ömrümüzün hər anında, atdığımız hər addımda imtahana çəkilirik. Şeytan daim bizi aldatmaq barədə düşünür. Onun məqsədi xoş niyyətlərimizi puça çıxarmaqdır. Onun məqsədi budur ki, insan zahirdə ibadət edib xalqa xidmət göstərsə də, Amerika və digər Allah düşmənləri ilə mübarizəyə qalxsa da, məqsədi qeyri-ilahi olsun. İnsanlar əməllərin zahirini görür, batinindən xəbərsiz qalır. Amma nəhayət bir gün bütün iç məqsədlər açıqlanır. Amma Allahın övliyaları bu dünyada da insanların iç .məqsədlərindən xəbər tutur

İlkin İslam dövründəki savaşlardan birində Peyğəmbərin (s) yaxınlarından olan bir gənc meydana daxil oldu. O misilsiz bir şücaətlə vuruşdu və sonda öldürüldü. Bu gəncin qəhramanlığı ətrafdakıları heyran qoymuşdu. Onlar həmin gəncin behiştdəki uca məqamından dəm vurduqları vaxt Peyğəmbər (s) buyurdu: "Onun behiştdən bir .payı yoxdur." Səhabələr təəccüblənib deyilənlərin səbəbini soruşdular

Peyğəmbər (s) buyurdu: “Biz Mədinədən savaş meydanına yola düşərkən həmin gənc bizə qoşulmayıb Mədinədə qaldı. Sonradan Mədinə qadınları onu şəhərdə görüb dedilər: “Gənclərimiz cəbhəyə getdilər, bu gənc isə şəhərdə gəzir. Qadınların sözü gəncin şəxsiyyətinə toxundu və o cəbhəyə getmək qərarına gəldi. Həmin gənc xalq onu tərif etsin deyə, düşmənlə savaşa qatıldı və öldürüldü. Şöhrət üçün savaşdığından ”.onun cəbhədə iştirakı Allah hüzurunda dəyərli deyil

## Bəndəlik, Allaha etiqad və imam Rahilin müvəffəqiyyət səbəbi

Qeyd olunduğu kimi, ibadət təkcə namaz və orucdan ibarət deyil. Allahın razılığı üçün görülən bütün işlər ibadətdir. İnsan Allaha yaxınlıq məqsədi ilə kiçik bir addım atırsa, Allah həmin səmimi əməli ibadət sayır. Allah bəndələri arasında elələri var ki, ömrünün hər anını Allaha həsr edir. O bütün işləri görərkən Allahın razılığı sorağında olur. Bütün ömrünü ilahi vəzifəsinin icrasına, dinin dirçəlişinə sərf etmiş imam Rahil də bu qəbildəndir. İmam bütün ömrünü din yolunda sərf edib çətinlikləri arxada qoydu. O Allaha təvəkkül edərək xalqın himayəsi ilə dünya zalımlarını məğlub etdi, ilahi və İslami .inqilab qalib gəldi

İmamın məsuliyyəti, möhkəm imanı, sabitqədəmliyi, düşmən qarşısında şücaəti ilə tanış olmaq üçün onun keçdiyi inqilab yolunu öyrənmək lazımdır. Zalım Pəhləvi rejimi dünya zorlularına arxalanıb bütün imkanlardan faydalanaraq ölkədə qorxu-hürkü yaratdığı bir vaxt az adam bu rejimə qarşı çıxmağa cəsarət edirdi. Həmin böhranlı vəziyyətdə Qum ruhanilərindən biri boş əllə bu rejimlə mübarizəyə qalxdı. Şəmsi ۱۳۴۲-ci ildə, öz alovlu çıxışında həmin şəxs fəryad çəkdi ki, İslam təhlükədədir və şahın dinsiz hökuməti məhv edilməlidir. Həmin vaxt Qum alimlərindən bəziləri imama etinasızlıqla yanaşır və bildirirdilər ki, təpədən dırnağadək silahlanmış rejimlə savaşa

qalxmaq yumruqla tankın savaşıdır. Onlar imamdan hansı büdcə ilə silah əldə edəcəyini, dünya imperializminə arxalanan bir rejimi necə yıxacağını soruşurdular. Həmin vaxt imam buyurdu: “Mən məsuliyyət hiss edirəm və Allahın öhdəmdə qoyduğu vəzifəni yerinə yetirmək üçün bu rejimlə mübarizəyə qalxıram. Bütün çətinlikləri və təhlükələri qəbul edirəm.” İmam üçün ən mühümü öz ilahi vəzifəsinə əməl etmək idi. Bəli, həmin vaxt azğınlıq və pozğunluq bütün məmləkəti hədələyirdi. Mövcud imkansızlıq və pəhləvi rejiminin gücü imamın iradəsini sarsıda bilmədi. O Allahın sonsuz qüdrətinə arxalanaraq ayağa qalxdı. İmam Allahın bir vədinə əmin idi: “Bir çox kiçik dəstə Allahın izni ilə böyük dəstəyə qalib gəldi. Allah səbirlilərlədir.”(١)

Çox keçmədi ki, gənc tələbələr və dünyaya bağlı olmayan cavanlar imamın ətrafında toplandılar. Amma bir çox yaşlı insanlar nəinki imama qoşulmurdular, hətta onu Amerika və Amerikanın muzduru olan bir rejimə qarşı qalxdığı üçün məzəmmət edirdilər. İmam əmin idi ki, qələbə təkcə pul və imkandan asılı deyil. O həqiqi qələbəni səbirdə, təqvada və Allahın sonsuz qüdrətinə güvənməkdə görürdü. Qurani-kərimdə buyurulur: “Əgər səbirli olub təqva yolunu seçsəniz, onların hiyləsi sizə heç bir zərər yetirməz. Şübhəsiz, Allah gördüyünüz bütün işlərdən xəbərdardır.”(٢)

Nəhayət imamın xalisanə təlaşları və yaxınların səyləri ilə proqnozların əksinə olaraq on beş il sonra Allahın vədi gerçəkləşdi. Böyük İslam inqilabı qalib gəldi və dünya bu işə heyran qaldı. İnqilabdan neçə on il ötəndən sonra onun əzəməti daha da artmışdır, bu inqilab dünyada özünə daha artıq dost qazanmışdır. Dünyanın azadlıqsevər məzlum millətləri bu inqilaba dərin bir sevgi bəsləməkdədir. İmam Rahilin imanı, allahpərəstliyi və ixlası azadlıqsevər insanların qəlbində elə bir eşq alovu şölələndirmişdir ki, o dünyasını dəyişdikdən neçə



---

١- [٩٩] “Bəqərə”, ٢۴٩

٢- [١٠٠] “Ali-İmran”, ١٢٠

illər sonra da ziyarətçilər uzun yollar adlayıb Behişti-Zəhraya, azadlıq carçısının .ziyarətinə üz tuturlar

Bəli, xalqın, xüsusi ilə gənclərin qəlbini imama heyran qoyan, insanları candan keçib onun göstərişlərini yerinə yetirməyə sövq edən, möminləri bütün varlıqları ilə inqilabın keşiyində saxlayan böyük rəhbərin iman və ixlası idi. Çünki imam hansısa firqə mənafeləri və ya nəfs istəklərinə görə qiyam etməmişdi. Onun bütün fəaliyyətləri dinin dirçəlişinə, xalqa xidmətə yönəlmişdi. Xalq onu himayə edib kömək göstərir, hətta imamın müqəddəs amalları yolunda canlarından keçirdilər. Amma unutmamalıyıq ki, yalnız partiya mənafeləri üçün çalışmayan insanlar bu günədək inqilab yolunda möhkəm dayanmışlar. Onların imanına, Allahla əhdlərinə heç bir xələl gəlməmişdir. Amma ixlası olmayanlar, Allahın razılığı üçün addım atmayanlar yarı yolda şeytan vəsvəsələrinə düçar olmuş qeyri-ilahi niyyətlər səbəbindən bu böyük imtahandan uğurla çıxa bilməmişlər. Ömrünü mübarizə və inqilab yolunda keçirmiş bəzi fərdlər qoca yaşlarında kənara çəkilmiş, ya da inqilabın böyük amallarına müxalif mövqe tutmuşlar. Hətta neçə illər cəbhədə Allah düşmənləri ilə vuruşub əlil olmuş bəziləri dünyapərəstliyə düçar olub inqilabdan üz çevirmişlər. Diqqətli olmalı və bilməliyik ki, ilahi sınaq meydanındayıq. Əgər bu vaxtadək həmin imtahanda müvəffəq olmuşuqsa, yolun davamına diqqət göstərməliyik. Görəsən qarşıdakı yolda Allahın razılığını soraqlayırıq, yoxsa dünyəvi mənafelər izləyirik? Görəsən İslamın dirçəlişi məqsədində olanlara səs veririk, yoxsa dinimizi başqalarının dünyasına satırıq? Unutmamalıyıq ki, hər birimiz Allaha bəndəlik üçün xəlq olunmuşuq. Bu səbəbdən də daim Allahın razılığını nəzərdə tutub bu razılığı soraqlayanları himayə etməliyik. Dini dəyərlər uğrunda vuruşanları boşlayıb, dünyəvi mənafelər uğrunda təlaş göstərənləri dəstəkləməməliyik. Belələri müvəffəq olarsa, öz dünyəvi mənafeləri təmin edilər və .bizə qalan cəhənnəm, dünya və axirət zərəri olar

### Səkkizinci məclis

### Allah qorxusunun məfhumu və zərurəti

Ya Musa! Məni xof, qorxu, vahimə ilə çağır. Hüzurumda üzünü torpağa qoy, ən şərəfli“ vücudunla səcdə qıl. Mənimlə qorxmuş qəlblə minacat et. Bütün ömrünü Tövratla diri saxla. Mənim yaxşılıqlarımı və mədh olmuş sifətlərimi cahillərə öyrət, nemətlərimi onlara xatırlat. Onlara de ki, azğınlığa düçar olsalar ondan çəkinsinlər. Çünki mənim ”.cəzam həqiqətən ağırdır

### ?Qorxu nədir

Bu nəsihətin başlanğıcında Allah-təala həzrət Musaya əmr edir ki, qorxu dolu qəlblə onu çağırsın. Bu hissədə hər üçü qorxu mənasını bildirən “xovf”, “işfaq”, “vəcl” sözləri işlədilmişdir. Bu sözlər demək olar ki, sinonimdir və eyni mənanı bildirir. Onların təkrarlanması mənanın vurğulanması məqsədi daşıyır. Hazırkı qüdsi hədisdə və bir çox ayə və rəvayətlərdə Allah qorxusu məsələsi önə çəkildiyindən bu barədə bir qədər .danışmaq yaxşı olar. Amma öncə qorxu məfhumunu araşdıraq

Qorxu insanın təhlükə və ya zərər qarşısında özünü göstərən psixoloji durumudur. Qorxu təbii və qeyri-iradi bir reaksiyadır. Bu reaksiya əxlaqi baxımdan dəyərləndirilmir, yaxşı və ya pis sifət sayılmır. Qorxu da şadlıq kimi bir refleksdir. Əgər bir insanın ayağına iynə batarsa o dərhal reaksiya göstərir. Təhlükə ilə üzləşən insan özündən asılı olmayaraq qorxur, rəngi dəyişir. Belə bir hal istənilən bir adamda təbiidir, hətta şücaətli fərdlərdə də müşahidə olunur. Qurani-kərim həzrət Musanın sehrbazların sehrləri müqabilində

reaksiyasına işarə ilə buyurur: “Musa bir qorxu keçirdi. Dedik ki, sən üstünsən, (qorxma.”(١)

Əlbəttə ki, qorxudan öncəki müqəddimələr insanın iradəsindən asılı ola bilər. Onların mənfi və ya müsbət səciyyələndirilməsi mümkündür. Bəzən insan ondakı qorxu hissini gücləndirən hərəkət və rəftarlara yol verir. Məsələn, qorxaq insanlar xüsusi ilə gecə vaxtı tək qaldıqda uydurma təsəvvürlərlə qorxu hissini gücləndirirlər. Nəticədə bu qorxu ciddi ruhi sarsıntıya çevrilir. Bəzən isə insan xüsusi məşğələlərlə özündəki qorxunu azalda bilir. Məsələn, gecə gəzintiləri ilə qaranlıq qorxusunu canından çıxarır. Bu müqəddimələr insanın özündən asılı olduğu üçün yaxşı və ya pis sayıla bilər. Əgər insan qorxduğu üçün qınanırsa, əslində bu qorxunu yaradan müqəddimələr nəzərdə tutulur. Qorxu və qorxaqlıq ayrı-ayrı məfhumlardır. Qorxu qeyri-iradidir və yalnız təhlükə ilə rastlaşarkən yaranır. Qorxaqlıq isə insanın xarakterində möhkəmlənmiş bir sifətdir. Qorxaqlığın rahattələblik kimi mənşələri var. Bu baxımdan qorxaqlıq bəyənilmir. Qorxaq insanda çətinliklərə müqavimət cürəti yoxdur. Belələri müxtəlif çətinliklərlə müşayiət olunan ictimai vəzifələrdən boyun qaçırırlar. Qorxaq insan kiçik .təhlükələrdən uzaq olmaq üçün böyük mənfəətlərdən məhrum qala bilər

Ərəb dilində qorxaq insan “cəban” adlanır. Bu söz “cübn” sözündən götürülmüşdür. Bu sözün antonimi “şüca” sözüdür. Əgər qorxaqlıq bəyənilməyən sifətdirsə, şücaət müsbət səciyyə sayılır. Ərəb dilində “cübn” sözü “xovf” sözündən fərqləndiyi üçün “xaif” mənası da “cəban” mənası ilə eyni deyil. Cəban dedikdə qorxaq, xaif dedikdə qorxmuş mənaları nəzərdə tutulur. Qorxaqlıq xasiyyətdirsə, qorxu ötüb keçən bir haldır. Amma hər iki sözün kökü qorxudan olduğu üçün onlar bir-birinə qarışdırılır və .yanlış anlaşılır



---

Taha”, ۶٧, ۶٨“ [١٠١] -١

Hazırkı müqəddimənin ardınca insanın iradəsindən asılı olan, insan tərəfindən zəiflədə .və ya gücləndirilə bilən qorxu ilə bağlı üç sualı cavablandıracağıq

**?Nə üçün dini təlimlərdə Allah qorxusu zəruri sayılır**

Sual ١: Nəzərə alsaq ki, qorxu mənfi bir sifətdir və psixoloqlar onu məzəmmət edib, psixoloji tarazlığın pozulması səbəbi sayır, Quran və rəvayətlərdə Allah qorxusunun mədh olunması sual doğurur. Qorxu prinsipcə bəyənilmiş sifətdirmi ki, Allah və Onun ?əzabından qorxu da müsbət sayılsın

Cavab: Qeyd etdik ki, qorxu öz-özlüyündə təbii bir hal olduğundan mənfi və ya müsbət dəyərləndirilmir. Bəyənilən və ya məzəmmət olunan isə qorxu yox, onun müqəddiməsidir. Yəni qorxu yox, qorxunu yaradan müqəddimə araşdırılmalıdır. Qorxunun güclənməsi və davamı onun səbəb və nəticələrindən asılıdır. Bəzən qorxu bəyənilir. İnsan onun həyatını hədələyən təhlükələrdən çəkinməlidir və ehtiyatlı olmalıdır. Qorxub-çəkinmədən istənilən bir təhlükəyə doğru hərəkət bəyənilməyə də bilər. Macəra axtaran, özünü oda-suya atan, istənilən bir təhlükəyə qucaq açan insanlar yetərincə sağlam və ağıllı sayılmır. Əgər qorxunun səbəb və nəticəsi müsbətdirsə, bu qorxunu gücləndirmək mədh olunur. Heç şübhəsiz, Allah qorxusu .müsbət nəticələr verdiyi üçün zəruri sayılmışdır

**Allah qorxusunun məfhumu**

Sual ٢: "Allah qorxusu dedikdə nə nəzərdə tutulur? Adətən, təhlükəli mövcudlar müqabilində qorxu yaranır. Əgər Allah sonsuz məhəbbət və rəhmət sahibidirsə nə ?üçün ondan qorxmalıyıq

Cavab: Qorxunun qaynağı insanın üzləşə biləcəyi təhlükədir. Bəzən də hər hansı mənfəəti əldən çıxarmaq düşüncəsi qorxuya səbəb olur. Amma səbəblə nəticə arasında əlaqə olduğundan bəzən insan təkcə təhlükədən yox, təhlükəni səh:٧٩

yaradan səbəbdən də qorxur. Məsələn, kimi qarşısına çıxmış canavardan, kimi də qaranlıqdan qorxur. Çünki canavar və qaranlıq insanın həyatını hədələyən vasitələrdir. Tövhid prinsiplərinə əsaslanan İslam təlimlərində, eləcə də ayə və rəvayətlərdə insanın diqqəti "səbəblər səbəbinə" yönəldilir. Bu təlimə əsasən insan canavardan qorxduğu kimi canavarı yaratmış və canavarın ixtiyarı əlində olan Allahdan, "səbəblər səbəbindən" qorxmalıdır. Məsələn, yağışdan sonra torpaqdakı toxum cücərib inkişaf edir. Amma toxumun cücərib inkişaf etməsi üçün zəruri olan bütün vasitələr Allahın ixtiyarındadır və onun iradəsi ilə təsir göstərir. Bu səbəbdən Qurani-kərim toxumun cücərməsi və inkişafını Allaha aid edərək buyurur: "Həqiqətən, Allahdır toxumu və çərdəyi çatladıb cücərdən!"(١)

Məsələn, yerdən buxarlanan su havada soyuduqdan sonra yağış şəklində torpağa qayıdır. Amma yağışın əsas səbəbi buludlar yox, Allahdır. Günəşi yaradıb, onun istisini su hövzələrinə çatdıran, bu prosesin həyata keçməsi üçün qanunlar tənzimləyən Allah-təaladır. Buxarlanma da, kondensasiya da Allah tərəfindən tənzimlənmiş ilahi qanunlardır. Suyun buxarlanması, onun havada buludlar şəklinə düşməsi, yerin cazibəsi vasitəsi ilə yağış şəklində torpağa qayıtması dəqiq qanunlar əsasında həyata keçir. Yağış da, qar da Allahın tədbir və iradəsi ilə yerə enir. Bütün bunları nəzərə alaraq Qurani-kərimdə buyurulur: "Ümidlər üzüldükdən sonra yağışı endirən, rəhmətini genişləndirən Odur. Odur həmd olmuş hami."(٢)

Aydın olur ki, insanların diqqətinin səbəb salana yönəldilməsi Quranın tərbiyə üsuludur. Bizi hədələyən zərərdən, mənafeləri əldən çıxarmaq ehtimalından qorxsaq da, bu qorxular ikinci dərəcəlidir. İnsan onun həyatı üçün təhlükə törədən seldən qorxur. Əslində isə bu sel Allahın ixtiyarındadır və Allahdan qorxmaq lazımdır. Bəli, bütün təhlükələr səbəblər səbəbi olan Allahın ixtiyarındadır.



---

١- [١٠٢] "Ən'am", ٩٥

٢- [١٠٣] "Şura", ٢٨

Amma əxlaqi baxımdan dəyərləndirilən rəftarlar sırasında Allah qorxusu əslində insanın öz çirkin əməllərindən qorxusudur. Nəzərdə tutulmuş qanunları pozan insan ilahi şəriət qanunları əsasında əzaba düçar olur. Bağışlanmağımız da, cəzalandırılmağımız da Allahın ixtiyarındadır. Qurani-kərimdə oxuyuruq: "İnsanların öz pis əməlləri səbəbindən quruda və suda fəsad görünər. Allah bəzi günahların cəzasını onlara daddırar ki, bəlkə tövbə qıldılar."(۱) Başqa bir ayədə oxuyuruq: "Rastlaşdığınız hər bir müsibət öz qazancınızdır və Allah onların çoxunu bağışlayır."(۲)

Aydın oldu ki, Allah qorxusu dedikdə əsasən öz pis əməllərimizdən qorxu mənası nəzərdə tutulur? Bu əməllər bizi ilahi nemətlərdən məhrum edir, bir çox ağrılar yaşadır. Unutmamalıyıq ki, günahkarların Allah tərəfindən cəzalandırılması Allahın mərhəmət sifətinə zidd deyil. Allah mərhəmətlilər mərhəmətlisi olmaqla yanaşı ədalətlidir və bu ədalət tələb edir ki, başqalarına sitəm qılanlar cəzalandırılsın. Əgər yaxşı baxsaq, Allahın cəzasında da mərhəmət var. İnsanlar dünyada cəzalandırılmaqla təmizlənir, onların bir sıra günahları bağışlanır. Bağışlanmayan günahlara görə axirət cəzası nəzərdə tutulur. Əgər Allah bütün günahların cəzasını bu dünyada versəydi, yer üzündə bir nəfər olsun sağ qalmazdı. Quranda oxuyuruq: "Allah insanları gördükləri işə görə cəzalandırsaydı, yer üzündə bir canlı da saxlamazdı. Amma müəyyən müddətədək onlara möhlət verilir, əcəlləri çatdıqda, Allah bəndələrini görəndir."(۳)



---

۱- [۱۰۴] "Rum", ۴۱

۲- [۱۰۵] "Şura", ۳۰

۳- [۱۰۶] "Fatir", ۴۵

Sual ٣: Allah qorxusu məfhumu aydınlaşdıqdan sonra belə bir sual yaranır ki, Allah öz bəndələrini qorxutmaq əvəzinə başqa bir tərbiyəvi üsul seçə bilməzdimi? Olmazdımı ?ki, bəndələr mükafat vədi ilə doğru yola dəvət edilsin, günahdan çəkindirilsin

Cavab: Qısaca belə cavab vermək olar, Allah-təala bizi daha yaxşı tanıdığından hansı üsulun daha təsirli olacağını bilir. Əzab vədi daha təsirli üsuldur və Allah öz peyğəmbərlərini qorxudan ünvanında göndərir. Quranda oxuyuruq: "Biz səni haqq olaraq müjdə verən və qorxudan ünvanında göndərdik. Aralarında qorxudan (peyğəmbər olmayan heç bir ümmət olmadı."(١)

Peyğəmbərlər həm müjdə, həm də əzab vədi ilə dəvət etsələr də, onlar daha çox .qorxudan ünvanı ilə təqdim olunmuşlar

Uyğun sualı psixoloji baxımdan da cavablandırmaq olar. Elmi və təcrübi üsullarla sübuta yetirilmişdir ki, qorxu hissi insanları işə daha çox təşviq edir. Demək olar ki, insanı təlaşa təhrik edən ٩٠ faiz qorxudur. Təlaşa təşviq baxımından müjdə yalnız ١٠ faiz təsirə malikdir. İnsanlar adətən uğursuzluq qorxusundan çalışırlar. Tənbehdən, ata-ananın məzəmmətindən, ətrafdakıların qınağından qorxmayan insan adətən bir çox işlərdən, eləcə də təhsildən yayınır. Çox az tələbəni elmə sövq edən eşqdir. Bu səbəbdən də ata-ana öz övladlarını təhsilə təşviq etmək üçün onu uğursuzluğun pis .aqibəti ilə qorxudurlar

Əksərimiz həm cəhənnəm əzabına, həm də behişt nemətlərinə etiqadlı olsaq da, çox vaxt vəzifələrimizi əzab qorxusundan yerinə yetiririk. İnsanların çox az qismi savab və mükafat ümidi ilə öz vəzifəsini yerinə yetirir. Əlbəttə ki, bəzi işlərdə insanı fəaliyyətə təşviq edən təkcə ümiddir. Axı müəyyən işlərin yerinə yetirilməməsi müqabilində cəza nəzərdə



---

١- [١٠٧] "Fatir", ٢٤"

tutulmamışdır. Bəli, müstəhəb işlər müqabilində savab nəzərdə tutulur və bu işləri tərk edənlər cəzalandırılmır. Əlbəttə ki, bu məqamda da mükafatı əldən çıxarmaq qorxusu .olur

Aydın olur ki, fərdi və ictimai həyatda bir çox rəftar və əməllərin hərəkətvericisi qorxudur. Çətinlik, nemətləri itirmək, hörmətdən düşmək qorxusu bu qəbil qorxulardandır. Amma axirət dünyasına inananlar üçün birinci gecə qəbir qorxusu, cəhənnəm qorxusu daha təsirlidir. Mənəvi baxımdan ali mərifət dərəcəsinə çatanlar üçün ən böyük və ən üzücü qorxu Allahın diqqətindən məhrumluq qorxusudur. Bəli, belə bir məhrumluq böyük əzabdır. Bu səbəbdən də Allah-təala əhd-peymanı pozanları məzəmmət edərkən onların diqqətdən məhrum edilməsini böyük əzab sayır və buyurur: "Allahın əhdini və öz andlarını ucuz qiymətə satanlar üçün axirət bəhrəsi yoxdur. Allah qiyamət günü onlarla danışmaz, onlara baxmaz, onları paklamaz. Onlar (üçün ağrılı əzab olacaq."(١)

Uşaqlar üçün aclıq ana nəvazişindən məhrumluqdan daha asan olduğu kimi, Allahla ünsiyyət şirinliyini dadanlar üçün cəhənnəm əzabından da ağır Allahın diqqətindən məhrumluqdur. Beləcə, Allahın lütf və diqqətindən məhrumluq qorxusu aşiqlər üçün .bəndəlik vəzifələrinin yerinə yetirilməsində ən güclü mühərrikdir

**Allah qorxusunun işdə tövhidlə rabitəsi**

Allah qorxusunun əhəmiyyət və zəruriliyini göstərən digər bir nöqtə budur ki, insan özündə güc və qüdrət gördükdə qarşılaşacağı hadisələrdən qorxmur. Bu baxımdan yetkin və güclü fərdlərlə müqayisədə uşaqlar daha çox qorxur. Çünki onlar zəifdirlər və başqalarının təzyiqi qarşısında özləri üçün təhlükə hiss edirlər. Uşaqlarda müdafiə gücü olmadığından daha çox qorxur, müqavimət göstərə bilmirlər. Amma yetkin insanlar, xüsusi ilə öz həmyaşıdlarından daha güclü olanlar bir



---

Ali-İmran", ٧٧" [١٠٨] -١

çox təhlükələrlə üzləşməkdən qorxmurlar. Çünki onlar özlərində təhlükəni aradan qaldırmaq üçün yetərincə güc görürlər. Deməк, zəiflik çoxaldıqca qorxu da çoxalır. Daha zəifin qorxusu da daha çoxdur. Digər bir tərəfdən insanın kamilliyi Allaha tam bəndə olmaqdadır. Kamil insan özünü Allahın mülkü bilir, zəifliyi öz zati səciyyəsi sayır. O əmindir ki, başdan ayağa qadir Allaha ehtiyaclıdır və sonsuz qüdrət sahibi olan Allah .qarşısında özünü tam aciz sayır

İmanı daha kamil olanlar, tövhidə daha çox inananlar Allahdan daha çox qorxur. Onlar bilirlər ki, qarşıya çıxan təhlükələri Allahdan savayı kimsə aradan qaldıra bilməz. Eyni zamanda Allahdan başqası onlar üçün təhlükə yarada bilməz. Quranda oxuyuruq: “Əgər Allah sənə bir zərər yetirsə ondan savayı bu zərəri aradan qaldıracaq kəs yoxdur. Əgər Allah sənə xeyir istəsə, Onun bəxşişinin qarşısını alacaq alacaq bir şəxs yoxdur. Allah bəndələrindən istədiyinə yetirər. O bağışlayan və mehribandır.”(۱)

Ali işdə (əfali) tövhid mərtəbəsinə çatanlar, xeyir və zərəri Allah tərəfindən bilənlər heç bir təhlükəyə qarşı özlərində qüdrət görmürlər. Onlar əmindirlər ki, yalnız Allah təhlükəni aradan qaldıra bilər. Beləcə Allahdan qorxur, Onun sonsuz qüdrətinə məftun qalırlar. Allah-təala bu sayağı tövhidə işarə ilə buyurur: “Göylərin və yerin hökmü əlində olan, özünə heç bir övlad götürməmiş Allahın şəriki yoxdur. O hər şeyi yaratmış və əvvəlcədən müəyyənləşdirmişdir”; “Müşriklər isə Onu yox, heç nə yaratmamış, özləri yaradılmış, özlərinə nə bir xeyir, nə də zərər verə bilən, diriltməyə, öldürməyə, yenidən ayağa qaldırmağa gücü olmayan bütləri özlərinə məbud götürmüşlər.”(۲)

Şübhəsiz ki, belə bir tövhid dərəcəsinə çatmış şəxs özünə güvənmir, Allahdan qorxduğu üçün yalnız Onun sonsuz qüdrətinə arxalanır. Onu Allahdan savayı heç nə .qorxutmur



---

۱- [۱۰۹] “Yunis”, ۱۰۷

۲- [۱۱۰] “Fürqan”, ۲, ۳

Çünki Allahdan başqa hər nə varsa onu özü kimi zəif və aciz görür. Allahın xalis bəndəsi olan imam Rahil ali mənəvi və tövhidi mərtəbəyə çatmışdır. İmam şəmsi ۱۳۴۲-ci il xordad ayının ۱۵-də sitəmkar şah rejiminin ciddi təhlükələri ilə qarşılaşdığı vaxt buyurmuşdur: “And olsun Allaha, bir an belə qorxmadım.” İmamda bu sayağı arxayınçılığı yaradan yalnız sonsuz ilahi qüdrətə inamı və güvənməsi idi. İmam əmin idi ki, Allahın istək və iradəsi qarşısında bütün iradələr və güclər zəifdir. O əmin idi ki, yalnız Allah qarşısında əyilib, Allahdan qorxan kəs başqa heç nədən qorxmayasıdır və Allah belə şəxsin qorxusunu düşmənlərin qəlbinə salasıdır. İmam Sadiq (ə) bu barədə buyurur: “Bir şəxs Allahdan qorxarsa, Allah hər kəs və hər şeyi onunla qorxudar. Bir şəxs Allahdan qorxmazsa, Allah onu hər kəs və hər nədən qorxudar.”(۱)

**Yer üzündə fəsad törətməyin aqibəti**

Allah-təalanın həzrət Musaya öyüdlərinin sonunda Allah qorxusu məsələsinə nəzər saldıq. Allah-təala həzrət Musadan tələb edir ki, Bəni-İsrailə belə desin: “Onlara de ki, azğınlığa düçar olsalar ondan çəkinsinlər. Çünki mənim cəzam həqiqətən ağırdır.”

Allah-təala həddini aşıb yer üzündə fəsad törədənləri cəzalandırır. İlahi əzablar növbənövdür. Bu əzab fərdi, ictimai, dünyəvi, mənəvi və üxrəvi ola bilər. Allahla minacat ləzzətini duymamaq da bir növ əzabdır. Amma bu dünyada ən ağır əzab istidrac qanununa düçar olmaqdır. Bu qanun ilahi göstərişlərə əməl etməyən, tövsiyələrdən təsirlənməyib gücü çatdıqca fəsad törədənlərə tətbiq edilir. Belələrinin qəlbində hidayət nuru sönür. Allah belələrinə daha artıq nemət əta etməklə onların qarşıdakı əzablarını artırır. Onlar elə təsəvvür edirlər ki, ixtiyarlarına verilmiş nemət Allahın razılığını göstərir. Onlar nəinki peşiman olmur, arxayınlıqla öz günah yüklərini



---

۱- [۱۱۱] “Biharul-ənvar”, c. ۶۹, bab ۳۸, s. ۴۰۶, h. ۱۱۴

ağırlaşdırırlar. Belələri qəflətə düçar olduqlarından Allah tərəfindən ağır əzab hazırlandığını anlamırlar. Hansı ki zaman ötdükcə onların geriyə qayıdışı və tövbəsi mümkünsüz olur. Allah-təala istidrac əzabı haqqında buyurur: "Kafir olanlar təsəvvür etməməlidirlər ki, onlara verdiyimiz möhlət xeyirlidir. Bu möhlət günahlarını daha artırmaları üçündür. Onları zəliledici bir əzab gözləyir."(۱) Digər bir ayədə oxuyuruq: "Verilmiş nəsihətləri unutduqlarından bütün qapıları onların üzünə açdıq. Verilmiş nemətlərə görə sevindikləri vaxt onları qəfil yaxaladıq və həmin vaxt ümidlərini itirdilər."(۲)



---

۱- [۱۱۲] "Ali-İmran", ۱۷۸

۲- [۱۱۳] "Ən'am", ۴۴

## Doqquzuncu məclis

### Allahla rabitə və başqalarından ehtiyacsızlıq

Ya Musa! Mənimlə rabitən qırılan vaxt məndən qeyriləri ilə rabitən bərqərar olmaz“ (rahatlaşacağın sığınacaq tapmazsan). Mənə pərəstiş et, fəqir və heç nəyi olmayan bəndə tək qarşımda dayan. Nəfsini məzəmmət etməklə məşğul ol, onun məzəmməti daha önəmlidir. Mənim kitabımla (Tövratla) Bəni-İsrail qarşısında öyünmə. Bu kitab ”.nəsihət, sənin qəlbinə öyüd, aydınlıq üçün yetər. Çünki o aləmlərin Rəbbinin kəlamıdır

### Ayə və rəvayətlərdə Allahla rabitə mövzusu

Qüdsi hədisin bu bəndinin başlanğıcında Allah-təala tövsiyə olaraq həzrət Musaya və möminlərə xəbərdarlıq edir ki, Allahla rabitəyə münasibətdə ehtiyatlı olsunlar. Əgər bu rabitə qırılarsa insan başqa biri ilə rabitə qura bilməz və ya quracağı rabitə ona əmin-amanlıq gətirməz. Oxşar təbirlərlə Quran ayələrində də rastlaşırıq. Allah öz bəndələrinə tövsiyə edir ki, Allahla rabitələrini möhkəmləndirsinlər. Ayələrdən birində (oxuyuruq: “Hamınız Allahın ipinə sarılın və pərakəndə düşməyin.”(١

Bu ayədə ilahi ip vəhdət və birlik amili kimi tanıtdırılır. Bəzi rəvayətlərdə bu təbir Əmirəl-möminin (ə) və Əhli-beyt (ə) kimi təfsir olunur. İmam Kazimdən (ə) uyğun ayə (ilə bağlı belə nəql olunmuşdur: “Allahın möhkəm ipi Əli ibn Əbu-Talibdir (ə).”(٢

İmam Baqirdən (ə) həmin ayə haqqında soruşularkən buyurmuşdur: “Bizik Allahın möhkəm ipi.”(٣) Bəzi ayələrdə



---

Ali-İmran”, ١٠٣“ [١١٤]-١

Təfsiri-nurus-səqəleyn”, c. ١, s. ۴۴٨“ [١١۵]-٢

Həmin mənbə, s. ۴۴٩ [١١۶]-٣

Allahla rabitə vasitəsi “ürvə”, yəni tutacaq kimi təbir olunur. Allah buyurur: “Dində heç bir məcburiyyət yoxdur. Doğru yol əyri yoldan aşkar seçildi. Hər kəs tağutu inkar edib Allaha iman gətirsə, şübhəsiz, möhkəm dəstəkdən yapışmışdır və o qırılası deyil. Allah eşidən və biləndir.”(١)

Bu ayədə “ürvətul-vüsqa” ifadəsi rəvayətlərə əsasən iman, Quran, Əhli-beyt (ə) vilayəti mənasında təfsir olunur. İmam Baqir (ə) uyğun təbirlə bağlı buyurur: “Ürvətül-vüsqa” Əhli-beyt (ə) sevgisidir.”(٢)

İmam Sadiq (ə) həmin ayənin təfsiri ilə bağlı buyurur ki, nəzərdə tutulan bir olan və şəriksiz Allaha imandır.

İmam Riza (ə) buyurur: “İmam Hüseynin (ə) nəslindən olan imamlara itaət edən Allaha itaət etmişdir. Onlara müxalif olan Allaha müxalif çıxmışdır. Onlar möhkəm tutacaq və Allaha doğru bir vasitədir.”(٣)

Həzrət Quran haqqında buyurur: “Quran Allahın möhkəm ipidir, Onun möhkəm tutacağıdır.”(۴)

### Allahla rabitənin mərhələləri

İlahi dəstəkdən tutmaq üçün iki mərhələ nəzərdə tutulur:

Birinci mərhələ: İslamın etiqadi, əxlaqi, fiqhi, fərdi və ictimai ayinlərdən ibarət olduğunu nəzərə alsaq Allah ipindən yapışmaq elə İslam ayinlərinə bağlılıq kimi qəbul olunmalıdır. Bu mərhələdə Allahla zəruri rabitə həddi ilahi göstərişləri yerinə yetirmək, vacib əmrləri yerinə yetirib haramlardan çəkinməkdən ibarətdir.

Vacib əmrləri yerinə yetirib haramlardan çəkindikdən sonra müstəhəb əmrləri yerinə yetirib bəyənilməz işləri tərk etmək də insanın Allahla rabitəsinə təsir göstərir. Demək, Allahın ipinə sarılmaq şəri və ilahi göstərişləri yerinə yetirmək,



---

١- [١١٧] “Bəqərə”, ٢۵۶

Təfsiri-nurus-səqələyn", c. ۱, s. ۳۱۷" [۱۱۸] -۲

Həmin mənbə, s. ۱۳۸ [۱۱۹] -۳

Həmin mənbə [۱۲۰] -۴

təqva yolunu seçməkdir. Bu halda qərar tutan insanı Allah şeytanın tələlərindən xilas edib səadətə çatdırır. Allahın vacib və haram hədlərini gözləməyib günaha düşənlər .xoşbəxtlikdən məhrum olub azğınlığa düçar olur

Başqa sözlə Allah-təala özü ilə rabitəni möhkəm ipə bənzədir. Bu ipin bir tərəfində insan, bir tərəfində behişt qərar tutmuşdur. Həmin ipdən möhkəm yapışıb yuxarı qalxan behiştə çatır. İpdən aşağı isə cəhənnəm və fəlakət var. Əli boşalıb ipi buraxan .kəs cəhənnəmə yuvarlanır

İkinci mərhələ: İnsanın maddi, mənəvi və ruhi ehtiyacları böyükdür. Bu ehtiyaclar təmin olunmasa insan məhv olar. Təbii ki, insan bu ehtiyacları təkbaşına təmin edə bilməz. O başqalarının sorağınca getməyə məcburdur. Ehtiyacların təmini üçün başqalarının vasitəsi seçilməsi həmin qırılmaz ipə yapışmaqdır. Bəndə qida, məskən, sağlamlıq kimi ehtiyaclarını təmin etmək üçün varlıq aləminin həqiqi sahibi olan Allaha üz tutmalı, səmimi qəlbdən ona sığınmalıdır. Şübhəsiz ki, bu yolu seçib Allaha diqqət yetirməklə ehtiyaclarını təmin etmək istəyən kəsi Allah-təala sonsuz nemətlər vadisinə çatdırasıdır. Ən əsası belə bir insan Allaha diqqət nemətindən bəhrələnir, bu diqqət sayəsində başqalarının kiçikliyini anlayır. Bu məqama çatan bəndə Allahdan .qeyrisinə ağız açmır

Amma bir şəxs iman zəifliyi və qəflət səbəbindən Allahdan qeyrisinin sorağınca gedərsə Allah onu həmin yalançı məbudlar qarşısında alçaldar. Onun xahişi rədd olunduqda təkrar-təkrar ağız açar, bəzən istəyinə çatmaq üçün özünü alçaldar. İnsan Allahdan qeyrisinə üz tutduğu vaxt yaltaqlıq, mədhiyyəçilik kimi pis sifətlərə düşür. .Bütün bu rəzalətlərdən sonra da onun öz istəyinə çatacağı məlum deyil

Allahdan xəbərsiz insanlar öz istəyinə çatmaq üçün istənilən bir günaha batır. Bəziləri məsələn prezident olmaq üçün milyardlarla pul xərcləyir, bu yolda böhtandan, yalandan, təhqirdən çəkinmir. Çox vaxt beləläri min bir alçaqlıqla səh:

razılaşsalar da məqsədlərinə çata bilmirlər. Hətta məqsədlərinə çatdıqdan sonra .xoşbəxtliyin tamını dadmırlar

Bəli, Allahla rabitəsi qırılan kəs makiyavelistcəsinə istənilən bir yolla məqsədə çatmağa çalışır. O halal-haram yol tanımır, hətta ixtiyarında olan beytül-malı, (dini büdcəni) haraya gəldi xərcləyir. Belələri xalqa zülümdən, təcavüzdən, onların şəxsiyyətini alçaltmaqdan qorxmurlar. Bir neçə sarayı, fabrik-zavodu, gündəlik milyonlarla qazancı .olanlar var ki, bir an dayanmadan öz olanlarını artırmağa çalışır

Aydın oldu ki, Allahla rabitə, Onun ipinə sarılma iki mərhələdə gerçəkləşir. Birinci mərhələdə bəndə vacib əməlləri yerinə yetirib haramlardan çəkinir, ikinci mərhələdə Allaha təvəkkül etməklə başqalarının əlindən gözünü çəkir. Quranın müxtəlif ayələrində bu nöqtələrə işarə olunmuşdur. Bəzi ayələrdə Allahın xaliqliyi, varlıq aləminə nəzarəti, eləcə də Ona pərəstiş və təvəkkülün zəruriliyi bəyan olunur: "Budur sizin Rəbbiniz. Yoxdur Ondan başqa məbud. O hər şeyi yaradandır. Ona pərəstiş edin, (O hər şeyə nəzarətçidir."(١

Bəzi ayələrdə Allaha ibadət və təvəkkül göstərişləri yanaşı zikr olunur: "Göylərin və yerin batini Allaha məxsusdur. Bütün işlər Ona doğru qayıdar. Ona pərəstiş və (təvəkkül et, sənin Rəbbin gördüyünüz işlərdən qafil deyil."(٢

Həmd surəsində də Allahın gözəl sifətləri zikr olunduqdan sonra "yalnız Sənə ibadət" edir və yalnız Səndən kömək diləyirik" ayəsində ibadətin iki mərhələsinə işarə olunur: Allaha təvəkkül və Ondan yardım istəyi. Hər gün on dəfə "həmd" surəsini oxumaq bizim vəzifəmizdir. Bu surədə pərəstiş və yardım istəyi yalnız Allaha aid edilmişdir. Məlum olur ki, dinin əsas qayəsi Allaha pərəstiş və bu sonsuz mənbəyə təvəkküldən ibarətdir. İnsan ehtiyaclarının təmin olunmasını Allahdan diləməli və Ondan .qeyrilərindən ümidini üzməlidir



---

١-[١٢١] "Ən'am", ١٠٢

٢-[١٢٢] "Hud", ١٢٣

## Allahla rabitənin səmərəsi

Zikr olunmuş iki mərhələyə bağlılığın səmərəsi budur ki, insan bəndəlik və ibadətdən, Allaha təvəkküldən sonra özünü tam ehtiyacsız hiss edir, ətrafdakıların münasibətinə əhəmiyyət vermir. Onun üçün xalqın dostluğunun və ya düşmənçiliyinin fərqi yoxdur. Bu münasibətlər onun halını dəyişmir. Uyğun məna imam Baqirin (ə) Cabir ibn Yezid Cövhiyə xitabında belə zikr olunur: "Bil ey Cabir! Nə qədər ki, xalq sənin ziddinə şəhadət verib bir ağızdan pisliyinə danışdıqda narahat olursan və ya onların səni saleh bilməsi səni sevindirirsə, bizim vilayətimizdə deyilsən."(١)

Allahı tanıyıb bütün varlığı ilə Ona iman gətirən kəs Allahdan qeyrilərindən qorxmur və onlara ümid etmir. O möminlərə, ata-anasına, ustad-müəllimlərinə bir vəzifə olaraq ehtiram göstərir və qədirdanlıq edir. Onun bu ehtiramda heç bir umacağı yoxdur. Bundan da üstünü odur ki, insan ali kamal və mərifət mərhələsinə çatıb öz varlığını Allahla rabitədə görsün. O yaranmışdır, Allah isə yaradan. Onun varlığının səbəbi Allahdır. Fəlsəfədə buyurulduğu kimi nəticə eynən səbəblə bağlılıqdan ibarətdir. Təbii ki, belə bir yüksək mərifət dərəcəsinə çatan insan məbuda diqqətdə qərq olub özünü yaddan çıxarır. Əksinə, Musaya nəsihətdə qeyd olunduğu kimi, Allahla rabitəsini qıran insan bütün sığınacaqlardan məhrum olur, onun üçün heç bir güvənc yeri qalmır.

## Allahdan qeyrisinə ağız açmağın məzəmməti

İmam Sadiqin (ə) bəzi qədim peyğəmbərlərin kitablarından nəql etdiyi qüdsi bir hədisdə belə nəql olunur: "Allah-təala buyurur: "İzzət və cəlalıma, ərş üzərində rəfət və hökmümə and olsun, məndən qeyrisinə ümid bağlayanın ümidini puça çıxararam. Xalq arasında ona zillət libası geydirər, onu özümə yaxınlıqdan və fəzlimdən məhrum edərəm. Çətinliklər səh:٩١

---

١- [١٢٣] "Biharul-ənvar", c. ٧٨, bab ٢٢, s. ١٦٢, h. ١

müşküllər mənim əlimdə olduğu halda o necə başqalarına ümid bağlayır?! Bütün bağlı qapıların açarı mənim əlimdə olan vaxt o necə məndən başqasının qapısını döyür?! Mənim evimin qapısı məni çağıranların üzünə açıqdır... O kimdir ki, çətinliklər vaxtı mənə ümid bağlayıb və mən onun ümidini puça çıxarmışam? O kimdir ki, böyük işlərdə mənə ümid edib və mən onun ümidini qırmışam? Mən bəndələrimin arzularını yadda saxladım, amma onlar bununla razılaşmadılar. Səmaları mənim təsbihim və mənə sitayişdən yorulmayanlarla (mələklərlə) doldurdum və onlara tapşırdım ki, heç vaxt bəndələrimlə mənim aramda olan qapıları bağlamasınlar. Amma onlar mənim sözlərimə (vədələrimə) etimad göstərmədilər. Məgər bəndəm bilmirmi ki, bir hadisə onun qapısını döydüyü vaxt mənim iznim olmadan kimsə onu qoruya bilməz?! Axı nə üçün məndən üz döndərirlər? Mən öz səxavətimlə məndən istəmədiklərini ona verdim. Verdiyimi geri alanda məndən istəmədi ki, ona bir daha əta edim. Yoxsa elə düşünür ki, məndən istəməmiş ona əta edərəm?! Məndən istəsə onun istəyinə cavab verməzəmmi?! Mən xəsisəmmi ki, bəndəm mənim haqqımda belə düşünür? Məgər bütün ətalar məndən deyilmi?! Məgər əfv və rəhmət mənim əlimdə deyilmi?! Məgər mən arzuların ünvanı deyiləmmi?! Beləsə, məndən savayı kim bu arzuları təmin edə bilər?! Ümid edənlər məndən qeyrisinə göz dikməyə qorxmurmu?! Əgər göylərin və yerin bütün əhli mənə ümid bağlasa, onların hər birinə bütün başqalarının arzu etdiyi qədər verərəm və mülkümdən qarışqa ayağı qədər azalmaz. Mənim ixtiyarımda olan bir mülk necə azalar?! Mənə itaətsizlik edib məndən qorxmayanın vay halına!"(۱)

Əlhəmdulillahi-Rəbbil-Aləmin!

səh:۹۲

---

۱- [۱۲۴] Üsuli-kafi", c. ۲, bab ۲۱۸, s. ۶۶, h. ۷

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər surəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

